QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Fevral 2016
02 (1075)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Birinci Türkoloji Qurultayın 90 illik yubileyinin keçirilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

2016-cı ildə Bakı şəhərində Birinci Türkoloji Qurultayın keçirilməsinin 90 illiyi tamam olur.

Türkoloji Qurultay türk xalqlarının mədəni inteqrasiyasında yeni mərhələnin təməlini qoymuş diqqətəlayiq hadisələrdəndir. Qurultayda əsaslı müzakirə obyektinə çevrilmiş problemlərlə bağlı böyük perspektiv əhəmiyyətə malik qərarlar qəbul edilmiş, latın qrafikalı yeni əlifbaya keçidin elmi-metodik prinsipləri işlənib hazırlanmışdır. Həmin əlifbanın ilk kütləvi tətbiqinə türkdilli respublikalardan məhz Azərbaycanda başlanılması hələ XIX əsrdən etibarən burada mütərəqqi ziyalıların əlifba islahatı uğrunda fəal şəkildə apardıqları mübarizənin nəticəsi idi. Lakin sovet idarə üsulu çox keçmədi ki, bütün bunların ardıcıl gerçəkləşdirilməsinin qarşısını müxtəlif vasitələrlə aldı.

XX yüzilliyin sonlarına doğru Azərbaycan Respublikasının öz dövlət müstəqilliyini bərpa etməsi ilə Azərbaycan dilinin rəsmi dövlət dili statusu qəti surətdə təsbit edildi və Türkoloji Qurultay tərəfindən vaxtilə irəli sürülmüş tövsiyələrin müasir şəraitdə uğurla həyata keçirilməsi üçün əlverişli zəmin yarandı. Bir əsr boyunca üçüncü dəfə dəyişdirilməyə məruz qaldıqdan sonra latın qrafikalı yeni əlifbaya keçildi və ölkənin ictimai-siyasi həyatının, xalqın yazı mədəniyyəti tarixinin taleyüklü məsələlərinin həlli istiqamətində mühüm addımlar atıldı.

Qurultaydan bəri ötən dövr türkologiyaya dair araşdırmalar sahəsində yeni konsepsiyaların formalaşdırılması, Azərbaycanın türkoloji araşdırmaların nüfuzlu mərkəzlərindən biri kimi tanınması və türk xalqlarının mədəni-mənəvi birliyinin nəzəri-elmi bünövrəsinin yaradılması ilə əlamətdardır. Qazanılan nailiyyətlər eyni zamanda qurultayın təşkili işinə töhfələr vermiş totalitar rejim qurbanı görkəmli alimlərin xatirəsinə ehtiramın ifadəsidir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və türk xalqlarının, o cümlədən Azərbaycan xalqının mədəni həyatında müstəsna rol oynadığını nəzərə alaraq Birinci Türkoloji Qurultayın 90 illik yubileyinin layiqincə keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Milli Elmlər Akademiyası Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi ilə birlikdə Birinci Türkoloji Qurultayın 90 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 18 fevral 2016-cı il*

## Azərbaycan Respublikasının Nazirlər Kabineti QƏRAR

*№ 30* *Bakı şəhəri, 3 fevral 2016-cı il*

### Orta ixtisas təhsili müəssisələrinin şəbəkəsinin optimallaşdırılması və Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2011-ci il 15 iyul tarixli 118 nömrəli qərarı ilə təsdiq edilmiş "Azərbaycan Respublikası Təhsil Nazirliyinin strukturuna daxil olmayan tabeliyindəki qurumların Siyahısı"nda dəyişikliklər edilməsi haqqında

Azərbaycan Respublikası Konstitusiyasının 119-cu maddəsinin səkkizinci abzasını rəhbər tutaraq, orta ixtisas təhsili müəssisələrinin şəbəkəsinin optimallaşdırılması, təkrarlanmanın aradan qaldırılması, idarəetmənin, maliyyələşdirmənin, kadr hazırlığının səmərəsinin və keyfiyyətinin yüksəldilməsi məqsədi ilə Azərbaycan Respublikası Təhsil Nazirliyinin təklifinə əsasən Azərbaycan Respublikasının Nazirlər Kabineti **qərara alır:**

1. Bakı Sosial Pedaqoji Kolleci Bakı Humanitar Kollecinə, Bakı Kompüter Kolleci Bakı İdarəetmə və Texnologiya Kollecinə, Şuşa Musiqi Kolleci Şuşa Humanitar Kollecinə qoşulsun.

2. Gəncə Texniki Kolleci və Gəncə Humanitar Kolleci birləşdirilərək Gəncə Dövlət Regional Kolleci adlandırılsın.

3. Şəki Pedaqoji Kolleci və Şəki Musiqi Kolleci birləşdirilərək Şəki Dövlət Regional Kolleci adlandırılsın.

4. Şamaxı Humanitar Kolleci və Şamaxı Dövlət Sənaye-İqtisad Kolleci birləşdirilərək Şamaxı Dövlət Regional Kolleci adlandırılsın.

5. Bakı Neft-Energetika Kolleci Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin nəzdində Bakı Neft-Energetika Kolleci adlandırılsın.

6. Sumqayıt Dövlət Texniki Kolleci Sumqayıt Dövlət Universitetinin nəzdində Sumqayıt Dövlət Texniki Kolleci adlandırılsın.

7. Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə qoşularaq, sonuncu Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci adlandırılsın.

8. Azərbaycan Respublikasının Təhsil Nazirliyi bu qərarın icrası ilə əlaqədar qənaət edilən maliyyə vəsaitinin kolleclərin infrastrukturunun gücləndirilməsinə yönəldilməsini, həmçinin azad olmuş maddi-texniki bazadan təhsil sisteminin məqsədləri üçün istifadə olunmasını təmin etsin.

9. Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Respublikasının Maliyyə Nazirliyi orta ixtisas təhsili müəssisələrinin maliyyələşdirilməsinin təkmilləşdirilməsinə dair təkliflərini 2 ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Nazirlər Kabinetinə təqdim etsinlər.

10. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2011-ci il 15 iyul tarixli 118 nömrəli qərarı (Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2011, № 7, maddə 745, № 10, maddə 969, № 12, maddələr 1241, 1245; 2012, № 3, maddə 257, № 4, maddə 399, № 6, maddələr 633, 634, № 12, maddə 1346; 2013, № 6, maddə 775, № 9, maddə 1130; 2014, № 1, maddə 72, № 2, maddə 214, № 6, maddə 751, № 7, maddə 907, № 9, maddə 1120; 2015, № 3, maddə 336, № 6, maddə 807, № 8, maddə 966, № 10, maddələr 1226, 1229; Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2015-ci il 2 dekabr tarixli 372 nömrəli qərarı) ilə təsdiq edilmiş "Azərbaycan Respublikası Təhsil Nazirliyinin strukturuna daxil olmayan tabeliyindəki qurumların Siyahısı"nın "Orta ixtisas təhsili müəssisələri" bölməsinin 14-cü, 16-cı, 17-ci, 23-cü, 28-ci, 35-ci, 41-ci hissələri ləğv edilsin, 5-ci, 10-cu, 20-ci, 22-ci, 26-cı və 33-cü hissələri aşağıdakı redaksiyada verilsin:

| | |
|---|---|
| 5. | Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci |
| 10. | Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin nəzdində Bakı Neft-Energetika Kolleci |
| 20. | Sumqayıt Dövlət Universitetinin nəzdində Sumqayıt Dövlət Texniki Kolleci |
| 22. | Gəncə Dövlət Regional Kolleci |
| 26. | Şəki Dövlət Regional Kolleci |
| 33. | Şamaxı Dövlət Regional Kolleci |

**Artur RASİ-ZADƏ,**
**Azərbaycan Respublikasının Baş naziri**

## Xocalı soyqırımı - tarixin qanlı faciəsi

### *ADPU-da Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş anım mərasimi keçirilib*




Fevral ayının 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş anım mərasimi keçirilib. Qeyd edək ki, anım mərasimində İraq Respublikasının Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Fədhil Əl Şuvaili, Fələstin Dövlətinin fövqəladə və səlahiyyətli səfiri cənab Nasir Əbdül Kərim Əbdül Rəhimi, Sudan Respublikasının fövqəladə və səlahiyyətli səfiri cənab Məhəmməd Elias Məhəmməd əl haq da iştirak ediblər. Anım mərasimindən öncə universitetdə Xocalı soyqırımını əks etdirən sərgi nümayiş etdirilib. Mərasimdə əvvəlcə Xocalı faciəsi qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov anım mərasimini giriş sözü ilə açaraq bildirib ki, bu günlər respublikamızda və dünyanın bir çox ölkələrində Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, akademik, hörmətli Ramiz Mehdiyevin imzaladığı müvafiq sərəncamla "Xocalı soyqırımının iyirmi dördüncü ildönümünün keçirilməsinə dair tədbirlər planı" təsdiq edilmişdir. Tədbirlər planında Bakı şəhərinin Xətai rayonunda, Goranboy rayon mərkəzində və Ağcakənd qəsəbəsində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ucaldılmış abidələrin önünə əklil qoyulması, mərasimlərinin keçirilməsi, Azərbaycanın xarici ölkələrdəki səfirliklərində, nümayəndəliklərində və diaspor təşkilatlarında bu soyqırımı ilə bağlı mətbuat konfranslarının, anım mərasimlərinin və digər tədbirlərin təşkili, xarici və yerli kütləvi informasiya vasitələrində, o cümlədən teleradio kanallarında, İnternet şəbəkəsində qanlı qırğını əks etdirən materialların yayılması və mütəmadi olaraq yenilənməsi nəzərdə tutulmuşdur. Eyni zamanda həmin sənəddə ölkədə fəaliyyət göstərən dini konfessiya və qurumlar tərəfindən Xocalı soyqırımı qurbanlarının xatirəsinə həsr olunan anım mərasimlərinin təşkil edilməsi, idarə və təşkilatlarda, teatr-konsert müəssisələrində, sərgi salonlarında, ali və orta məktəblərdə xatirə gecələri, foto-rəsm sərgiləri, şahidlərlə görüşlərin keçirilməsi, milli azadlıq uğrunda mübarizəyə həsr olunan sənədli və bədii filmlərin nümayiş etdirilməsi öz əksini tapmışdır.



Faciənin iyirmi dördüncü ildönümü ilə əlaqədar dövlət qurumları rəhbərlərinin, millət vəkillərinin və ziyalıların xocalıların müvəqqəti məskunlaşdıqları şəhər və rayonlarda-Bakı, Sumqayıt, Gəncə, Mingəçevir, Şəki, Goranboy, Bərdə, Sabirabad, Göyçay, Zaqatala, Oğuz və Balakən rayonlarında şəhid ailələri ilə görüşləri təşkil ediləcəkdir. Təhsil müəssisələrində fevralın 26-da ilk dərslər bu faciəyə həsr olunacaq, həmin gün saat 17.00-da bütün ölkə ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad ediləcək, respublikamızın şəhər və rayonlarında, kənd və qəsəbələrində Azərbaycanın dövlət bayraqları endiriləcək.

Qeyd edək ki, Təhsil naziri cənab Mikayıl Cabbarov fevral ayının 9-da təhsil müəssisələrində Xocalı soyqırımının iyimi dördüncü ildönümünün qeyd edilməsi barədə əmr imzalamışdır və həmin əmrə əsasən təhsil müəssisələrində keçiriləcək tədbirlər planı təsdiq edilmişdir. Tədbirlər planına müvafiq olaraq ali, orta ixtisas, ilk peşə, ümumi və məktəbdənkənar təhsil müəssisələrində fevral ayı ərzində Xocalı soyqırımına həsr olunmuş geniş tədbirlərin həyata keçirilməsi nəzərdə tutulur.

Yuxarıda qeyd edilən sənədlərə əsasən ADPU-da fevralın 16-da imzalanmış əmrə uyğun olaraq universitetdə Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilib. Belə ki, fevral ayının 18-dən başlayaraq universitetimizin bütün fakültələrində Xocalı soyqırımına həsr edilmiş fotostendlər yaradılıb, ədəbi-bədii gecələr, eyni zamanda soyqrımının şahidi olan insanlarla görüşlər keçirilib, azadlıq uğrunda mübarizəyə həsr olunmuş sənədli və bədii filmlər nümayiş etdirilib. Tələbə Gənclər Təşkilatı Kompüter Mərkəzi ilə birlikdə fevralın 23-də universitetin İnternet saytına Xocalı soyqırımını əks etdirən materiallar daxil edib. Fevral ayının 24-də ADPU-da təhsil alan türkiyəli tələbələrin fəal iştirakı ilə Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş könüllü

(Davamı 2-ci səhifədə)

# Xocalı soyqırımı - tarixin qanlı faciəsi

(Əvvəli 1-ci səhifədə)

qanvermə aksiyası keçirilib. Bu xeyirxah və humanist aksiyada 100-dən çox türkiyəli tələbə, həmçinin ADPU-nun çoxlu sayda əməkdaşı iştirak edib. Sabah universitetin bütün fakültələrində ilk dərs saatları Xocalı soyqırımına həsr ediləcək.

Rektor Y.Məmmədov çıxışı zamanı Xocalı soyqırımı haqqında ətraflı danışaraq qeyd edib ki, namərd və xain qonşularımız olan ermənilər keçmiş Sovet Ordusunun Xankəndidə yerləşən 366-cı motoatıcı alayının köməyi ilə həmin gecə 7 min əhalisi olan Xocalıda dəhşətli və qəddar bir cinayət törətdilər. Xocalı faciəsi XX əsrdə ermənilər tərəfindən xalqımıza qarşı törədilmiş növbəti kütləvi qırğın olmaqla bərabər, həm də Azərbaycanın ərazi bütövlüyünə və dövlət müstəqilliyinə qarşı yönəlmiş ənənəvi terror siyasətinin tərkib hissəsidir. Həmin o dəhşətli gecədə Xocalı şəhəri sakinləri ilə birgə tamamilə məhv edildi. Faciə zamanı 613 nəfər, o cümlədən 106 qadın, 63 uşaq, 70 qoca ermənilər tərəfindən xüsusi qəddarlıqla qətlə yetirildi, 1275 nəfər dinc sakin əsir götürüldü, 150 nəfər isə itkin düşdü, 8 ailənin həyatına son qoyuldu, 25 uşaq hər iki valideynindən, 130 uşaq isə valideynlərinin birindən məhrum oldu, 487 dinc sakin ağır yaralandı. Bu soyqırımı həm də bəşəriyyətə və insanlığa qarşı yönəlmiş ən qəddar cinayətlərdən biridir. Xocalı soyqırımı beynəlxalq hərbi cinayət aktıdır. Xocalı faciəsi bəşər tarixində misli görünməmiş bir cinayətdir.




Rektor Y.Məmmədov çıxışının bu məqamında deyib: "Xocalıda köməksiz uşaqlara qarşı törətdikləri vəhşilikləri ermənilər özləri də etiraf ediblər. 1996-cı ildə erməni yazıçısı Zori Balayanın müəllifliyi ilə işıq üzü görmüş "Ruhumuzun dirilməsi" adlı kitabın 260-262-ci səhifələrində yazılıb: "Mən və Xaçatur onların saxlandığı zirzəmiyə daxil olanda əsgərlərimiz artıq bir uşağı pəncərəyə hörmüşdülər. Onun çox səs-küy salmaması üçün ölmüş atasının dərisini qoparıb ağzına soxmuşdular. Sonra mən 13 yaşlı bir türkün baş, sinə və qarnından dərisini qopardım. Təxminən 7 dəqiqə sonra uşaq qan itkisindən öldü. Mən birinci dərəcəli həkim kimi humanistəm, ona görə də uşağın başına gətirdiyim zülmlərdən xoşbəxtlik hiss eləmirdim, lakin daxilən sevinirdim. Xaçatur uşağın cəsədini tikə-tikə doğradı və yem kimi itlərə atdı. Həmin axşam biz daha 3 türk törəməsinin başına həmin oyunu açdıq. Mən patriot vətəndaş kimi erməni borcumu yerinə yetirirdim". Belə bir qəddar, cəllad şəxsə necə yazıçı, həkim demək olar?!

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, Xocalıda baş vermiş hadisə terror aktı olsa da, həmin dövrdə Azərbaycanın rəhbərliyində təmsil olunan şəxslərin məsuliyyətsizliyi üzündən erməni vandalizminin əsl mahiyyəti dünya ictimaiyyətinə olduğu kimi




çatdırılmadı. Televiziyada və rəsmi mətbuatda düşünülmüş şəkildə guya Xocalıda cəmi 2 nəfərin öldürüldüyü bildirildi və bununla da milli maraqlarımıza böyük zərbə vurularaq, soyqırımı faktının miqyası kiçildildi.

Xocalı soyqırımının beynəlxalq ictimaiyyətə çatdırılması ilə bağlı əməli tədbirlər yalnız ulu öndərimiz Heydər Əliyevin xalqımızın çox böyük istəyi və inadlı tələbi ilə Azərbaycanda yenidən dövlət rəhbərliyinə qayıtmasından sonra həyata keçirildi. Məhz ümummilli liderimiz Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra işğalçı Ermənistanın Azərbaycana qarşı həyata keçirdiyi soyqırımı və terror siyasətinin mahiyyətini özündə dolğun əks etdirən faktların dünya ictimaiyyətinə çatdırılmasını müstəqil dövlətimizin xarici siyasətinin ən mühüm vəzifələrindən biri kimi müəyyənləşdirdi və bu vacib istiqamətdə səmərəli əməli tədbirlər həyata keçirdi. Bu məqsədlə atılan addımlardan biri isə Xocalı faciəsinə siyasi-hüquqi qiymətin verilməsi oldu. Xalqımızın dahi lideri Heydər Əliyevin təşəbbüsü ilə 1994-cü il fevralın 24-də Milli Məclisdə «Xocalı Soyqırımı Günü haqqında» qərar qəbul edildi, BMT-yə və dünyanın aparıcı dövlətlərinə bu faciənin mahiyyətini açıqlayan və beynəlxalq ictimaiyyəti erməni terrorçuluğuna qarşı təsirli tədbirlər görməyə çağıran müraciət ünvanlandı. Ulu öndərimiz Heydər Əliyev «Xocalı soyqırımı qurbanlarının xatirəsinə sükut dəqiqəsi edilməsi haqqında» 25 fevral 1997-ci il tarixli müvafiq sərəncam imzalamışdır ki, bu sərəncama əsasən hər il fevralın 26-sı saat 17.00-da Azərbaycan Respublikasının ərazisində Xocalı faciəsi qurbanlarının xatirəsinə ehtiram əlaməti olaraq sükut dəqiqəsi elan edilir.



Xocalı faciəsi zamanı həlak olmuş soydaşlarımızın ailələri hər bir zaman Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin diqqət mərkəzindədir. Respublikamızın 48 rayonunda məskunlaşmış xocalılara dövlət səviyyəsində hər cür qayğı və köməklik göstərilir.

Son illər Xocalı faciəsinin beynəlxalq miqyasda tanınması istiqamətində bir sıra uğurlu addımlar atılmışdır. Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, Yeni Azərbaycan Partiyasının Sədr müavini Mehriban Əliyeva bütövlükdə Azərbaycan həqiqətləri, o cümlədən Xocalı faciəsi haqqında beynəlxalq ictimaiyyətin lazımi səviyyədə məlumatlandırılması üçün səmərəli əməli fəaliyyət göstərir. Heydər Əliyev Fondunun vitse-prezidenti, İslam Əməkdaşlıq Təşkilatının Dialoq və Əməkdaşlıq üzrə Gənclər Forumunun baş əlaqələndiricisi, İDEA İctimai Birliyinin təsisçisi və rəhbəri Leyla xanım Əliyevanın təşəbbüsü ilə 2008-ci ilin may ayının 8-dən başlayaraq beynəlxalq miqyasda «Xocalıya ədalət!» kampaniyası həyata keçirilir. Bu kampaniyanın əsas məqsədi dünya ictimaiyyətini Xocalı soyqırımı barədə məlumatlandırmaq, beynəlxalq səviyyədə Xocalı soyqırımına adekvat siyasi-hüquqi qiymətin verilməsi, ədalətin təmin olunması və soyqırımı qurbanlarının xatirəsinin əbədiləşdirilməsidir. Kampaniya çərçivəsində dünyanın müxtəlif ölkələrində çoxsaylı tədbirlər keçirilib, təbliğat-təşviqat işi aparılıb. Bir çox dövlətlərin parlamentləri tərəfindən rəsmi şəkildə Xocalı hadisələri soyqırımı kimi tanınıb və Ermənistanın Azərbaycana qarşı təcavüzü pislənilib, 10-dan çox ölkə Xocalı hadisələrini soyqırımı kimi tanıyıb. Artıq ABŞ-ın 18 ştatında Xocalı faciəsi tanınıb. Hazırda Xocalı faciəsinin mənəvi və siyasi-hüquqi səviyyədə tanınmasına yönəlmiş bu kampaniya dünyanın bir çox ölkələrində uğurla davam etdirilir.



Bununla yanaşı, Leyla xanım Əliyevanın təşəbbüsü ilə «Xocalıya ədalət!» Beynəlxalq Kampaniyası İctimai Birliyi yaradılıb. «Xocalıya ədalət!» Beynəlxalq Kampaniyası İctimai Birliyinin yaradılmasında məqsəd dövlət təşkilatları və ictimai qurumlar tərəfindən bu istiqamətdə aparılan təbliğat-təşviqat işinin səmərəliliyinin artırılması və bu fəaliyyətin əlaqələndirilməsinin gücləndirilməsidir. Birlik tərəfindən Xocalı soyqırımı haqqında müfəssəl məlumatların toplandığı resurs bazası yaradılıb, müxtəlif kitablar, jurnallar, büroşuralar çap edilib, filmlər çəkilib. Tələbə-gənclər sosial şəbəkələrdə fəal olmalı, Xocalı faciəsi ilə bağlı həqiqətlərin dünya ictimaiyyətinə çatdırılmasında yaxından iştirak etməlidirlər.

Rektor Y.Məmmədov çıxışının sonunda qeyd edib ki, Azərbaycana qarşı yürüdülən ikili standartların nəticəsində Birləşmiş Millətlər Təşkilatı Təhlükəsizlik Şurasının Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişənin qeyd-şərtsiz həlli ilə bağlı qəbul etdiyi müvafiq qətnamələr bugünədək icra edilməyib. Dünya ictimaiyyəti nəinki bunu görmür, hətta Xocalı faciəsini soyqırımı kimi tanımaq istəmir. Digər tərəfdən, mətbuatda verilən məlumatlara görə, hazırda Dağlıq Qarabağ ərazisində 22 ölkənin mobil operator və turizm şirkətləri fəaliyyət göstərir. Bu da öz növbəsində Azərbaycana qarşı yürüdülən ikili standartların başqa bir nümunəsidir. Azərbaycan Prezidenti cənab İlham Əliyevin Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həlli ilə bağlı qətiyyətli mövqeyi belədir: Azərbaycan öz ərazisində ikinci bir erməni dövlətinin yaradılmasına əsla imkan verməyəcəkdir! Münaqişə beynəlxalq hüququn norma və prinsipləri əsasında, xalqımızın milli maraqlarına uyğun şəkildə öz ədalətli həllini tapmalıdır.

Tədbirdə İraq Respublikasının Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Fədhil Əl Şuvaili, Fələstin Dövlətinin fövqəladə və səlahiyyətli səfiri cənab Nasir Əbdül Kərim Əbdül Rəhimi, Sudan Respublikasının fövqəladə və səlahiyyətli səfiri cənab Məhəmməd Elias Məhəmməd əl haq çıxış edərək Xocalı faciəsini soyqırımı kimi səciyyələndirib, təmsil etdikləri ölkələrin birmənalı şəkildə Azərbaycanın ərazi bütövlüyünü dəstəklədiklərini bildirib və dünya ictimayətini Xocalı faciəsini soyqırımı aktı kimi tanımağa çağırıblar.

Anım mərasimində Xocalı soyqırımını əks etdirən film nümayiş olunub, Filologiya fakültəsi tələbələrinin ifasında ədəbi-bədii kompozisiya təqdim edilib.

**Mənsur İbrahimli,**
**Gülnar Süleymanova**

## Tək qalan Xocalım...

O gecə susmuşdu bütün kainat,
Bu qırğına gözünü yumurdu Tanrım...
O gecə axardan dönmüşdü həyat,
Vəhşidən insanlıq umurdu Tanrım...

O gecə almışdı:- "Qırmaq!"-əmrini,
Təpədən dırnağa zirehli dəstə.
Xalqımın inamın sındırmaq üçün
Tanklar yeriyirdi Xocalı üstə...

O gecə Vətənin Xocalı boyda,
Köksünə çarpaz dağ çəkirdi yağı...
O gecə zirehlər, tırtıllar altda,
Od tutub yanırdı ana qucağı...

İldırımı raket, şimşəyi mərmi,
Göylərdən yağırdı güllə yağışı.
Soy-kökü danmışdıq, ona görəmi,
Tanrımız qarğıdı belə qarğışı?

Zirehli tırtıllar əzib, yoğurub,
Qatırdı torpağa tər çiçəkləri...
Nənənin, babanın ixtiyar çağı,
Qana bulanırdı ağ birçəkləri...

Şirin canlarından keçən igidlər,
Köksündən alırdı güllə yarası.
O gecə namusun qorumaq üçün,
Gəlinlər boğurdu ciyərparəsin...

Dil açıb yalvarır bakirə qızlar:
-Özün öldür qardaş, düşmənə vermə!
Silahlar önündə girov gətməyə,
Əllərə düşməyə heç rəva görmə!

Anasından ayrı düşən körpənin,
Yarılırdı bağrı mərmi səsindən.
Görüb bu dəhşəti bərələn gözlər,
Pırtlayıb çıxırdı hədəqəsindən...

O qarlı-şaxtalı çölün düzündə,
Atılıb qalırdı başsız bədənlər.
Ayaqyalın, üryan, yesir kökündə,
Sayamı gəlirdi girov gedənlər?!

Coşqun sellər kimi axan qanlara,
Sən də şahid idin o gecə, Allah!
Bu faciələrə, müsibətlərə
Dözürdün, susurdun, də, necə, Allah!

O gecə susmuşdu, əmrə müntəzir,
Vəzifəsini xalqdan üstün tutanlar.
Qarnını qardaşdan irəli bilib,
İzzət-nəfsi üçün torpaq satanlar...

O gecə yorulmaq, susmaq bilməyən,
Hayqıran, ün salan Xocalım oldu.
Köməksiz, nicatsız şəhidləriylə,
Meydanda tək qalan Xocalım oldu...

O gecə zəng oldu sabaha qədər...
-Hay ver harayıma, Bakı, ay Bakı!
Ağdam, kömək göndər, xilaskarı ol,
Məsum körpələrin qucağımdakı...

Toplar dilə gəldi...Atəş açıldı...
Xəttin o başında susdu telefon...
Üç yüz altmış altı irəlilədikcə,
Xocalım boyandı qırmızı qana...

O gecə susmuşdu... Susdurulmuşdu...
Bədbəxt bir millətin bədbəxt rəhbəri.
Şahid olmaq üçün
bu vəhşiliyə,
Tarix dirigözlü
açdı səhəri...



**Mirvari Verdiyeva,**
**pedaqogika üzrə**
**fəlsəfə doktoru,**
**baş müəllim**

## ADPU-da qanvermə aksiyası

Fevral ayının 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu universitetdə təhsil alan türkiyəli tələbələrin fəal iştirakı ilə Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş könüllü qanvermə aksiyası keçirilib. Qanvermə aksiyasında iştirak edən ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, dosent Mehdi Abdullayev bu xeyirxah və humanist aksiyada 100-dən çox türkiyəli tələbənin, həmçinin universitetin çoxlu sayda əməkdaşının fəal iştirak etdiyini bildirib. Beynəlxalq əlaqələr üzrə prorektor, dosent M.Abdullayev qeyd edib ki, universitetin tələbə-gəncləri həmişə belə xeyriyyə aksiyalarında fəal iştirak edirlər. Bugünkü qanvermə aksiyasının təşəbbüsü də məhz tələbələr tərəfində irəli sürülüb.



Səhiyyə Nazirliyinin B.Eyvazov adına Elmi-Tədqiqat Hematologiya və Transfiziologiya İnstitutunun Mərkəzi Qan Bankının tibbi briqada heyəti qanvermə aksiyasına nəzarət edib. Qanvermə aksiyasında Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) "İcmaya əsaslanan sağlamlıq proqramı"nın rəhbəri Mətanət Qaraxanova və digər şəxslər də iştirak ediblər.

Qeyd edək ki, Ümumdünya Səhiyyə Təşkilatı ölkələrin öz qan ehtiyacını qarşılamaq üçün davamlı könüllü qanvermə sisteminə keçməsini məqsədəuyğun sayır. Hər bir dövlətin onu davamlı olaraq qan ehtiyacı ilə təmin edən ümumi fondunun olması vacibdir. Təcrübələr göstərir ki, qan analiz edilərək tədarük edilməli və nəql edildikdən sonra qan köçürülməsi həyata keçirilməlidir. Məlumat üçün onu da bildirək ki, hazırda AQAC tərəfindən "Gənc qan donorlar qrupu-25" adlı layihə həyata keçirilir. "Donor" sözünün mənası bəxş edən deməkdir. Qana ehtiyacı olan şəxsə isə respiyent deyilir. "Gənc qan donorlar qrupu-25" layihəsinin əsas məqsədi Azərbaycanda gənclər arasında sağlam və təhlükəsizlik həyat tərzinin təbliği və təşviqatı, həmçinin gənclərdən ibarət daimi, könüllü və təmənnasız donorlar şəbəkəsinin yaradılmasıdır. Bu layihənin əsas fəaliyyət istiqaməti isə gənclərin qan donorluğu və qan vasitəsilə əmələ gələn HİV/AİDS, Hepatitlər (B,C,D) və digər xəstəliklər haqqında məlumatlandırılması, həmçinin sağlam həyat tərzinin təbliğ edilməsidir.

Qan verən şəxslərə yüksək səviyyədə tibbi xidmət göstərilib və donor qanları Səhiyyə Nazirliyinin B.Eyvazov adına Elmi-Tədqiqat Hematologiya və Transfiziologiya İnstitutunun Mərkəzi Qan Bankına təhvil verilib. Aksiya zamanı toplanan qan laboratoriyada yoxlanıldıqdan sonra irsi qan xəstəliklərindən əziyyət çəkən hemofiliyalı və talassemiyalı xəstələrin müalicəsində istifadə olunacaqdır.

**Gülnar Bəxtiyarqızı**

# Elmi Şuranın iclası keçirilib

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının fevral ayının 19-da keçirilən iclasının gündəliyinə aşağıdakı məsələlər daxil idi: universitetdə struktur dəyişiklikləri haqqında; tələbə təqaüdü və ödənişi haqqında; əməkdaşların sosial vəziyyətinin gücləndirilməsi haqqında; ADPU-nun və filiallarının 2015-2016-cı tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələri haqqında hesabat; cari məsələlər; dosent və professor vəzifələrinə seçkilər.**

Elmi Şuranın iclasını ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Elmi Şuranın sədri, professor Yusif Məmmədov açıb. Rektor Y.Məmmədov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin sədrliyi ilə Nazirlər Kabinetinin yanvar ayının 10-da 2015-ci ilin sosial-iqtisadi inkişafının yekunlarına və qarşıda duran vəzifələrə həsr edilmiş iclasında,



eləcə də yanvarın 18-də Azərbaycan Respublikasının Prezidenti yanında iqtisadi və sosial məsələlərin həlli ilə bağlı keçirilən müşavirədə struktur islahatlarının aparılması, ölkədə islahatların dərinləşməsini və idarəetmə sahəsində optimallaşdırılmanın tətbiq edilməsini vacib vəzifələrdən biri kimi qarşıya qoyub. Bu baxımdan, ADPU-da da struktur dəyişikliklərinin həyata keçirilməsi mühüm bir vəzifə kimi qarşımızda dayanır. Universitetdə idarəetmənin təkmilləşdirilməsi, fakültə və kafedraların fəaliyyətinin səmərəliliyinin artırılması üçün bəzi fakültələrin birləşdirilməsi zərurəti yaranıb. ADPU-da bu istiqamətdə aparılan araşdırmalar və təhlillər də buna əsas verir.

Rektor Y.Məmmədov qeyd edib ki, Kimya fakültəsində "Kimya müəllimliyi", "Kimya və biologiya müəllimliyi", Biologiya fakültəsində isə "Biologiya müəllimliyi", Tarix fakültəsində "Tarix müəllimliyi", "Tarix və coğrafiya müəllimliyi", Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsində "Coğrafiya müəllimliyi", "Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi" ixtisasları üzrə kadrlar hazırlanır. Musiqi və təsviri incəsənət fakültəsində isə qabiliyyət tələb edən "Musiqi müəllimliyi", "Təsviri incəsənət müəllimliyi" ixtisasları üzrə kadr hazırlığı həyata keçirilir. Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsində kadr hazırlığı aparılan "Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi" ixtisası da bu qəbildən olan ixtisasdır. Bu xüsusiyyətləri nəzərə alaraq ADPU-nun idarəetmə strukturunun optimallaşdırılması məqsədilə Kimya, Biologiya, Tarix, Coğrafiya və çağırışaqədər hazırlıq, Musiqi və təsviri incəsənət fakültələrinin bazasında fakültə və ixtisasların aşağıdakı kimi formalaşdırılması təklif olunur:

1.Kimya və Biologiya fakültələrinin bazasında Kimya və Biologiya fakültəsinin yaradılması; bu fakültəyə "Kimya müəllimliyi", "Kimya və biologiya müəllimliyi" və "Biologiya müəllimliyi" ixtisaslarının daxil edilməsi;

2.Tarix, Coğrafiya və çağırışaqədər hazırlıq, Musiqi və təsviri incəsənət fakültələrinin bazasında Tarix və coğrafiya və Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültələrinin yaradılması;

3. Tarix və coğrafiya fakültəsinə "Tarix müəllimliyi","Tarix və coğrafiya müəllimliyi" və "Coğrafiya müəllimliyi" ixtisaslarının daxil edilməsi;

4. Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinə "Musiqi müəllimliyi", "Təsviri incəsənət müəllimliyi", "Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi" ixtisaslarının daxil edilməsi; Fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlığının tədrisi metodikası kafedrasının Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin tərkibinə keçirilməsi;

Elmi Şuranın üzvləri müzakirədən sonra sözügedən fakültələrin birləşdirilməsinə yekdilliklə səs veriblər.

Tələbə təqaüdü və ödənişi haqqında universitetin rektoru, professor Y.Məmmədov çıxış edib. Rektor Y.Məmmədov qeyd edib ki, "Doktorantlara, ali təhsil, orta ixtisas və ilk peşə-ixtisas təhsili müəssisələrinin tələbələrinə və şagirdlərinə verilən təqaüdlərin artırılması haqqında" Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 30 avqust tarixli 3108 nömrəli sərəncamında dəyişikliklər edilməsi barədə" Azərbaycan Respublikası Prezidentinin 10 noyabr 2015-ci il tarixli 1516 nömrəli sərəncamına əsasən, ali və orta ixtisas təhsil müəssisələrində əyani formada təhsil alan tələbələrə ödənişsiz və ya ödənişli əsaslarla təhsil almalarından asılı olmayaraq, təqaüdlər ümumi orta müvəffəqiyyət göstəricisi nəzərə alınmaqla, fənlər üzrə akademik nailiyyətlərinə görə ödəniləcək.

Ölkə Prezidentinin imzaladığı bu sərəncam "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na müvafiq olaraq, tələbələrə dövlət qayğısını artırmağa, onlarda təhsilə marağı stimullaşdırmağa, təhsilin keyfiyyətini yüksəltmək üçün təhsilalanlar arasında rəqabət mühitini yaratmağa və gənclərin sosial müdafiəsini daha da gücləndirməyə xidmət edir. Yeni qayda tələbə təqaüdünün həqiqi təyinatını özündə əks etdirir və ədalət prinsipinə əsaslanır.

Rektor Y.Məmmədov deyib ki, sərəncama müvafiq olaraq, Nazirlər Kabineti "Doktorantlara, ali təhsil, orta ixtisas və ilk peşə-ixtisas təhsili müəssisələrinin tələbələrinə və şagirdlərinə təqaüdlərin təyin edilməsi və ödənilməsi Qaydası"nın təsdiq edilməsi barədə 6 fevral 2016-cı il tarixli 38 nömrəli qərar verir. Təhsil naziri cənab Mikayıl Cabbarov 9 fevral 2016-cı ildə Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 6 fevral 2016-cı il tarixli 38 nömrəli qərarının icra olunması haqqında müvafiq əmr imzalayıb. Həmin əmrdə göstərilən əsas məqamlardan biri də ali, orta ixtisas və ilk peşə-ixtisas təhsili müəssisələrində təqaüd komissiyasının formalaşdırılması, tələbələrin ixtisaslar üzrə ümumi orta müvəffəqiyyət göstəricələrinin hesablanması, sıralama siyahılarını və buna əsasən təqaüd siyahısını, həmçinin fənlər üzrə akademik nailiyyətlərə görə təqaüd növlərinin müəyyənləşdirilməsidir. Bu əmrə uyğun olaraq ADPU-da da əmr imzalanıb, həm universitet üzrə Təqaüd Komissiyası, həm də fakültələr üzrə təqaüd komissiyaları yaradılıb.

Rektor çıxışında yeni qaydaları şərh edərək bildirib ki, bundan sonra ali və orta ixtisas təhsili müəssisələrində əyani formada təhsil alan tələbələrə ödənişsiz və ya ödənişli əsaslarla təhsil almalarından asılı olmayaraq, təqaüdlər ümumi orta müvəffəqiyyət göstəricisi nəzərə alınmaqla, fənlər üzrə akademik nailiyyətlərinə görə ödəniləcək. Belə ki, birinci yarımildən sonra tələbənin dövlət sifarişi və ya ödənişli əsaslarla təhsil almasından asılı olmayaraq, təqaüd təhsil müəssisəsinə cari ildə həmin ixtisas üzrə dövlət sifarişi ilə qəbul olunmuş tələbələrin ümumi sayı gözlənilməklə yüksək akademik göstəriciləri ilə fərqlənənlərə təyin ediləcək. Bu, aztəminatlı ailələrdən olan, ödənişli əsaslarla təhsil alan və yüksək akademik göstəriciləri ilə fərqlənən tələbələrə təqaüd almaq imkanı yaradır. Bununla yanaşı, yeni qaydalar qaçqın və məcburi köçkünlər, həmçinin təhsil haqqı dövlət tərəfindən ödənilən digər imtiyazlı ailələrdən olan tələbələrin sosial rifah halını yaxşılaşdırmağa kömək edəcək.

Qeyd edilənlərlə yanaşı, yeni qaydalar təhsilə marağı stimullaşdırmağa və təhsilalanlar arasında rəqabət mühitini yaratmağa imkan verəcək. Bu da öz növbəsində, təhsilin keyfiyyətinin yüksəldilməsinə və keyfiyyətli kadr hazırlanmasına xidmət edəcək.

Rektor Y.Məmmədov Elmi Şuranın iclasında həm də əməkdaşların sosial vəziyyətinin gücləndirilməsi haqqında çıxış edib. Rektor çıxışı zamanı deyib ki, dövlət başçımız cənab İlham Əliyevin bütün qurumların daha çevik və effektiv fəaliyyət göstərməsi, təşəbbüskarlığın artırılması və eyni zamanda ölkə vətəndaşlarının sosial vəziyyətlərinin gücləndirilməsi ilə bağlı verdiyi Sərəncam, Fərman, qərar, göstəriş, tapşırıq və tövsiyələri ADPU-nun rəhbərliyi də həmişə əsas tutur və bu istiqamətdə məqsədyönlü fəaliyyət həyata keçirir. Bu baxımdan, ADPU-nun Elmi Şurasının iclasında əməkdaşların sosial vəziyyətlərinin gücləndi-



rilməsi məqsədilə onların vəzifə maaşlarına edilən əlavənin artırılması məsələsi müzakirə olunmuş və yekdilliklə qərar qəbul edilib. Belə ki, ADPU-nun Elmi Şurasında qəbul etdiyi qərara əsasən bu ilin mart ayının 1-dən əməkdaşların əmək haqlarına onların vəzifələri və iş həcminə uyğun olaraq 30-200 manat məbləğində əlavələr ediləcəkdir. Hazırda ADPU-nun dekanlarının əmək haqları 1139 manat, kafedra müdirlərinin əmək haqları isə 1035 manatdır. Qeyd edək ki, əmək haqlarına artım ADPU-nun 1400-dən çox əməkdaşına şamil ediləcəkdir. Eyni zamanda Elmi Şuranın iclasında bu ilin fevral ayından başalayaraq normativ təhsil müddətində alt qruplarda (yay məktəbi istisna olmaqla) təhsil alan tələbələrin əlavə kreditlər üzrə təhsil haqlarının ADPU-nun daxili imkanları hesabına ödənilməsi haqqında da qərar qəbul edilib.

Bundan başqa, universitetdə tədrisin keyfiyyətini yüksəltmək, həmçinin dekan, kafedra müdirləri, dekan müavinləri və professor-müəllim heyətinin fəaliyyətini stimullaşdırmaq məqsədilə hər semestrin imtahan sessiyasının yekunlarına görə (nəzərdə tutulan şkalalara uyğun olaraq) növbəti semestrdə diferensiasiya prinsipi ilə əmək haqlarına əlavələr edilməsi barədə qərar verilib. Həmçinin tələbələr arasında rəqabət mühitini yaratmaq üçün hər semestrin sonunda ən yüksək göstəricilərə nail olan hər fakültənin bir qrupunun bütün tələbələrinə (həm dövlət sifarişi, həm də ödənişli əsaslarla təhsilalanlara) 1 aylıq təqaüdləri həcmində pul mükafatı verilməsi barədə qərar qəbul olunub. Qeyd edək ki, Elmi Şuranın universitet əməkdaşlarının və tələbələrin rifah halının yaxşılaşdırılmasına xidmət edən bu qərarları onların razılığına səbəb olub.

Elmi Şuranın iclasında ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov 2015-2016-cı tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələri haqqında hesabatla çıxış edib. Prorektor M.Cəbrayılov bildirib ki, ADPU-da payız semestrinin imtahan sessiyasında iştirak edən tələbələrin 90 faizi Kompüter Mərkəzində test üsulu ilə imtahan verib. Bəzi xüsusi fənlər-rəsm, boyakarlıq, musiqi və idman üzrə imtahanlar isə yazılı və ya şifahi formada aparılıb. Bu semestr testlər təkmilləşdirilib və onların keyfiyyəti yaxşılaşıb. Artıq bir hissə testləri bankda saxlamaq olar, 650 fəndən 408-i üzrə yeni testlər tərtib olunub. Test üsulu ilə imtahan verən tələbələr yüksək qiymət aldıqda onu yazılı imtahanda təsdiq edirlər. İmtahanların test üsulu ilə aparılması obyektivliyi, şəffaflığı təmin edir,yazılı imtahanlar isə fənni dərindən öyrənməyə kömək edir. İmtahan qərargahı payız semestrinin imtahan sessiyasına yüksək səviyyədə nəzarət edib. Münaqişə Komissiyasına 788 nəfər tələbə müraciət edib. Onların 40%-nin iddiası təmin edilib. Bu il müvəffəqiyyət faizi əvvəlki ildəkindən az fərqlənsə də, keyfiyyətdə xeyli irəliləyiş var. Həm fakültələrin Münaqişə Komissiyalarına, həm də universitet Münaqişə Komissiyasına edilən müraciətlər çevik araşdırılıb və müvafiq qərarlar qəbul edilib. Eyni zamanda ADPU-nun filiallarında monitorinqlər aparılıb. ADPU-nun filiallarında fəaliyyət göstərmiş monitorinq qrupları filiallarında işin yaxşı təşkil edildiyini bildiriblər.

Elmi Şuranın iclasında ADPU-ya qoşulmuş Azərbaycan Müəllimlər İnstitutunun Tədris işləri üzrə prorektoru, dosent Razim Məmmədov, ADPU-nun Quba filialının direktoru, professor Əli Allahverdiyev, Zaqatala filialının direktoru, professor Orucəli Rzayev, Şəki filialının direktoru, dosent Rafiq Rasulov, Qazax filialının direktoru, dosent Afaq Qasımova, Şamaxı filialının direktoru, dosent Tünzalə Yusifova, Ağcabədi filialının direktoru, dosent Mətanət Fərzəliyeva və Cəlilabad filialının direktoru, dosent Xudayar Sultanlı çıxış edərək 2015-2016-cı tədris ilinin payız semestrinin imtahan sessiyasının şəffaf, obyektiv keçdiyini və eyni zamanda keyfiyyətin diqqət mərkəzində olduğunu bildiriblər.

Elmi Şuranın iclasında ADPU-nun rektorunun müşaviri vəzifəsinin təsis edilməsi haqqında da qərar qəbul edilib. Eyni zamanda iclasda bir sıra cari məsələlər, o cümlədən ADPU-nun Tədris-Metodika Şurasının tərkibində dəyişiklik edilməsi haqqında məsələ müzakirə olunub, müvafiq qərar qəbul edilib, professor və dosent vəzifələrinə seçkilər keçirilib.

**Mənsur İBRAHİMLİ**

## Təhsil Nazirliyinin Qəbul Portalı istifadəyə verilib

Fevralın 4-də Təhsil Nazirliyinin Qəbul Portalının təqdimat mərasimi keçirilib. Təhsil Nazirliyinə və tabe qurumlara müraciət edən vətəndaşların vəzifəli şəxslər tərəfindən qəbulunun asanlaşdırılması, qəbula yazılma prosesinin təkmilləşdirilməsi, müraciətlərə baxılmasının sürətləndirilməsi və keyfiyyətinin yüksəldilməsi, eyni zamanda məlumatların ümumiləşdirilməsi üçün Vahid Qəbul Portalı yaradılıb.

Qəbul Portalının yaradılması Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin "Dövlət orqanlarında elektron xidmətlərin göstərilməsi haqqında" fərmanından və "Vətəndaşların müraciətləri haqqında" Azərbaycan Respublikasının Qanunundan irəli gələn vəzifələrin icrası işinin səmərəliliyinin artırılması məqsədlərinə xidmət edir.

Bu portal vasitəsilə Təhsil Nazirliyinin daxilində və tabeliyində olan qurumlarda vətəndaşların qəbullara yazılması, yönləndirilməsi, prosesin müşahidəsi, SMS göndəriş sistemi vasitəsilə qəbulun keçirilmə vaxtı barədə məlumatlandırılması və vətəndaş məmnunluğunun öyrənilməsi təşkil edilir. Portala daxil olan müraciətlərin statistikası aparılaraq təhlil edilir və toplanan statistik məlumatlar əsasında müvafiq hesabatlar hazırlanır.

Portaldan səmərəli istifadəni təmin etmək üçün Təhsil Nazirliyinin və tabe qurumların aidiyyəti əməkdaşları üçün təlimlər keçirilib.

# Tanınmış alim Mais Süleymanovla görüş

**Azərbaycan xalqının yüksək intellekt səviyyəsinə, geniş dünyagörüşünə malik alimlərindən biri də Pakistan İslam Respublikasının İslamabad şəhərində yerləşən COMSATS İnformasiya Texnologiyası İnstitutunun (CİİT) fizika üzrə professoru Mais Kazım oğlu Süleymanovdur. Görkəmli alim Mais Süleymanovun həyat və elmi fəaliyyəti ilə tanış olaq.**

**Mais Kazım oğlu Süleymanov 1953-cü il may ayının 2-də Bakı şəhərində anadan olub. 1975-ci ildən Moskva vilayətinin Dubna şəhərində yerləşən Birləşmiş Nüvə Tədqiqatları İnstitutunun (BNTİ) Yüksək enerjilər laboratoriyasında işləməyə başlayıb. 1980-cı ildə BNTİ-də fizika-riyaziyyat elmləri üzrə namizədlik (indi fəlsəfə doktoru), 2000 -ci ildə isə elmlər doktoru elmi dərəcələrini alıb. 2001-2003 illərində Çex Respublikası Elmlər Akademiyasının Nüvə Fizikası İnstitutunda, 2003-2006 illərdə isə yenidən BNTİ-də aparıcı tədqiqatçı işləyib. BNTİ-də NİCA, Avropa Nüvə Tədqiqatları Mərkəzində (ANTM) ALİCE, Almaniyada PANDA GSİ və digər elmi təşkilatların üzvüdür. COMSATS İnformasiya Texnologiyası İnstitutunda (CİİT, Pakistan) Akademik Şuranın üzvü və Fizika fakültəsinin məsləhətçisidir. Onun rəhbərliyi ilə 3 nəfər BNTİ-də, 4 nəfər isə CİİT-də fizika üzrə fəlsəfə doktoru elmi dərəcəsini alıb. 237 elmi məqalənin müəllifidir. Rus, ingilis, türk və çex dillərində danışır. Həyat yoldaşı Lalə xanım AMEA-nın Fizika İnstitutunda işləyir. Qızı Əzizə Süleymanzadə Harvard Universitetinin Fizika fakültəsinin bakalavrı, Kembric Universitetinin isə magistrı olub, hazırda Çikaqo Universitetinin doktorantdır.**



Məlumat üçün bildirək ki, Mais müəllim yüksək enerji fizikası, ultra-relyativistik ağır ion fizikası sahəsində fəaliyyət göstərən az sayda alimlərimizdən biridir. Bunun əsası isə hələ tələbəsi olduğu Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universitetinin) Fizika fakültəsindən başlayıb. Təhsilinin son ilində diplom işini BNTİ-nin yüksək enerjilər laboratoriyasında yazıb. 1982-ci ildə Mais müəllimin elmi-tədqiqat işləri yüksək dəyərləndirilərək Azərbaycanın gəns alimlərinin elm və texnologiya sahəsində diplom və mükafatına layiq görülüb. BDU-nu bitirdikdən sonra 25 il Dubnada elmi-tədqiqat işləri aparıb, orada namizədlik və doktorluq dissertasiyalarını müdafiə edib. Uzun müddət Rusiyada çalışmasına və beynəlxalq jurnallarda çap etdirdiyi çoxlu sayda məqalələrə görə Rusiya Elmlər Akademiyasının prezidenti Mais müəllimi 2008-ci ildə beynəlxalq diplom və mükafata layiq görüb. 2006-cı ildə Pakistan İslam Respublikasının Ali Attestasiyası Komissiyası M.Süleymanovu ölkəsinə dəvət edib və o, İslamabadda yerləşən CİİT-nin Fizika fakültəsində elmi və pedaqoji fəaliyyətinə başlayıb. İşə başladığı vaxtdan bu günə qədər Mais müəllimin rəhbərliyi ilə 4 nəfər fəlsəfə doktoru yetişdirilib, CİİT ilə BNTİ 2006 -cı il, ANTM (Cenevrə, İsveçrə) 2011-ci il və dünyanın digər universitet və elmi-tədqiqat institutları ilə geniş əlaqə yaradıb. CİİT-də magistr və doktorantlara ağır ion fizikası, yüksək enerjilərdə nüvə reaksiyalarının kinematikası, zərrəciklərin toqquşması və kvark-qlüon plazma fənlərindən dərs deyir. Apardığı elmi-tədqiqatlar yüksək temperatur və ya yüksək barion sıxlığında güclü qarşılıqlı təsirdə olan maddənin yeni hallarının, o cümlədən kvark-qlüon plazmanın öyrənilməsinə və ifrat yüksək enerjili kosmik şüaların tədqiqinə həsr olunub. Çap etdirdiyi məqalələrinin əksəriyyəti beynəlxalq nüfuzlu jurnallardır. Elmi işlərinin ümumi impakt faktoru 200 ətrafındadır.

Sevindirici haldır ki, tanınmış alim M.Süleymanov CİİT-nin rəsmi nümayəndəsi kimi fevral ayının 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovla görüşüb. Görüş zamanı ADPU ilə CİİT arasında Anlaşma Memorandumu imzalanıb. Hər iki tərəf ümidvar olduğunu bildirib ki, imzalanan sənəd ADPU-nun və CİİT-nin tələbə və professor-müəllim heyətinin mübadilə proqramları, birgə elmi tədbirlərinin keçirilməsi, qrant və layihələrdə iştirakı üçün əhəmiyyətli olacaqdır.

Qeyd edək ki, Mais müəllimin universitetimizin Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev ilə də görüşü səmərəli olub. Professor Vilayət Əliyevin Mais müəllimdən universitetin təbiət fənləri fakültələrinin tələbə, professor-müəllim heyəti üçün seminarda çıxış etməsi xahişini o, məmnuniyyətlə qəbul edib.

Seminar fevral ayının 16-da ADPU-nun kiçik akt zalında keçirilib. Tədbiri ADPU-nun Elmi işlər üzrə prorektoru, professor V.Əliyev aparıb. Seminarda ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Fizika fakültəsinin dekanı, professor Mirzəli Murquzov, Beynəlxalq əlaqələr şöbəsinin əməkdaşları Aynurə Əsgərova və Elnarə Bunyatova, ”Nadir torpaq metalları materialları fizikası” elmi-tədqiqat laboratoriyasının əməkdaşları, BDU-nun Nəzəri fizika kafedrasının müdiri, dosent Məmməd Rəcəbov, Sumqayıt şəhəri Nizami Gəncəvi adına Texniki və Təbiət elmləri Liseyinin müəllimi, ”İlin müəllimi” müsabiqəsinin ikiqat qalibi olmuş ixtisasca fizik Rahib Əfəndiyev, təbiət fənləri fakültələrinin professor-müəllim heyəti və tələbə-gəncləri iştirak ediblər. Bir sözlə, seminara maraq çox böyük idi.

Seminarın mövzusu ”Avropa Nüvə Tədqiqatları Mərkəzinin Böyük Hadron Kollayderinin əsas nəticələri” idi. Saat yarım davam edən seminarda Mais müəllim ”Kainat nədən təşkil olunmuşdur?”, ”Onları bir yerdə saxlayan nədir?”, ”Kütlənin mənbəyi nədir?”, ”Kainat necə əmələ gəlmişdir?” suallarına əsl alim nöqteyinəzərdən cavab verib. Mais müəllim birinci sual ətrafında spiker Standart Model, bu modelin əsasını təşkil edən və fundamental zərrəciklər hesab edilən 6 kvark və 6 leptondan danışıb. İkinci sualı cavab verərkən kainatda mövcud olan 4 növ: elektromaqnit, güclü, zəif və qravitasiya qarşılıqlı təsirləri, onların xarakteristikaları haqqında məlumat verib. Üçüncü sualı cavablandırarkən Standart modelin cavab verə bilmədiyini, kütlənin əmələ gəlməsinin Hiqqs mexanizmi ilə necə izah olunmasını, Hiqqs bozonun Böyük Hadron Kollayderinin ATLAS eksperimentində kəşfini, qeyri-məhdud enerjiyə malik kosmik şüalar, sürətləndirici və detektorlardan yüksək və ifrat yüksək enerjilər fizikasında necə istifadə olunduğunu seminar iştirakçılarına sadə şəkildə çatdırıb. Sonuncu suala cavab verərkən isə Nobel mükafatçısı, fizik S. Vaynberqin ”Böyük partlayışın ilk 3 dəqiqəsi” kitabından sitatlar gətirərək, Böyük partlayışdan təxminən 10,7 milyard il sonra kainatın keçdiyi yoldan danışıb. Sonda verilən suallara cavablar sadə şəkildə, qrafik, cədvəl və videomateriallarla müşayiət olunub.

Onu da qeyd edək ki, Mais müəllim növbəti görüşünü Qafqaz Universitetinin rəhbərliyi ilə keçirib. Qafqaz Universitetinin rektoru, professor Ahmet Saniç və professor M.Süleymanov Qafqaz Universiteti ilə CİİT arasında Anlaşma Memorandumu imzalayıblar. Görüşdə Qafqaz Universitetinin Elmi işlər üzrə prorektoru, professor Niftalı Qocayev, Beynəlxalq əlaqələr üzrə prorektor, professor Sevil İmanova, Layihələrin idarə edilməsi ofisinin müdiri Üzeyir Bağırov, ADPU-nun Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yaşar Hüseynəliyev, həmin şöbənin mütəxəssisləri Almarə Abbasova və Ülviyyə Bayramlı iştirak ediblər.

**Yaşar Hüseynəliyev,**
**Elm və innovasiyalar**
**şöbəsinin müdiri, dosent**

## SABAH tələbələri “Sağlam təhsil sinifləri”ndə təcrübə keçiblər

SABAH qrupları və “Sağlam təhsil-sağlam millət” layihəsinin əməkdaşlığı çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) SABAH qruplarında İbtidai sinif müəllimliyi ixtisasında təhsil alan III kurs tələbələri üçün təcrübə proqramı təşkil olunub. Tələbələr fevralın 1-dən-12-dək Bakı şəhərindəki 23, 26, 83, 114 və 214 nömrəli tam orta məktəblərin “Sağlam təhsil sinifləri”ndə pedaqoji təcrübə keçiblər.

Təcrübə müddətində “Sağlam təhsil-sağlam millət” layihəsinin metodistləri, psixoloqu, pedaqoqu, eyni zamanda ADPU-nun SABAH mərkəzinin rəhbəri mütəmadi olaraq siniflərə baxış keçirib və gənc müəllimlərə dəstək olublar.

Təcrübə proqramının yekununda tələbələrin planlaşdırdıqları “açıq dərs” izlənilib və onlar əvvəlcədən müəyyənləşdirilmiş tədqiqat mövzuları üzrə təqdimat ediblər. Davamiyyət, ünsiyyət, şagirdlərlə davranış, fəallıq və digər meyarlar üzrə metodist, psixoloq, sosioloq və sərbəst müşahidəçilər tərəfindən qiymətləndirilən tələbələr sonda Təhsil Nazirliyinin və Milli Təhsil Texnologiyaları Mərkəzinin sertifikatını əldə ediblər.

Qeyd edək ki, 2014-2015-ci tədris ilindən etibarən 7 ali təhsil müəssisəsində yaradılmış, hazırda 11 ali məktəbdə fəaliyyət göstərən, tələbələrə daha üstün təhsil və inkişaf imkanları təklif edən SABAH qrupları ali təhsil sahəsi üzrə ən aparıcı layihələrdəndir. “Sağlam təhsil-sağlam millət” layihəsi isə ümumi təhsil məktəblərində təhsilalanların sağlamlığının qorunmasına, təlim və yaradıcılıq nailiyyətlərinin yüksəldilməsinə xidmət edir.




**www.edu.gov.az**

## ADPU-nun Quba filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş anım tədbiri keçirilib

25 fevral 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında müəllim və tələbə kollektivinin iştirakı ilə Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş anım tədbiri keçirilib. Tədbirdə Yeni Azərbaycan Partiyasının (YAP) Quba rayon təşkilatının nümayəndələri, YAP-ın Quba rayon təşkilatının Gənclər Birliyinin sədri Habil Bayramlı istirak ediblər. Tədbirdə ilk olaraq Xocalı soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Sonra 1992-ci il fevralın 25-dən 26-na keçən gecə erməni qəsbkarlarının Azərbaycan xalqının başına gətirdiyi faciədən, tarix boyu ölkəmizə qarşı yürütdükləri işğalçılıq siyasətindən söz açılıb. Tədbirdə kinorejissor Vahid Mustafayevin “Xoca” filmi nümayiş etdirilib. Filmin nümayişindən sonra ADPU-nun Quba filialının kollektivi Quba Soyqırımı Memorial Kompleksini ziyarət ediblər.



Qeyd edək ki, ADPU-nun Quba filialının tələbə kollektivi Quba Rayon Gənclər Şurasının həyata keçirdiyi “Xocalı həftəsi” adlı layihənin də fəal iştirakçıları olublar. Belə ki, fevral ayının 20-də Quba Rayon Gənclər Şurasının İdarə Heyətinin üzvləri və Quba rayonunda yaşayan gənclərin, tələbələrin bir qrupu Qubada 2007-ci ildə aşkarlanmış, 1918-ci ildə ermənilər tərəfindən Azərbaycan xalqına qarşı törədilmiş soyqırımının izlərini özündə yaşadan məzarlığı ziyarət ediblər. Gənclərə məlumat verilərək bildirilib ki, tarix boyu ermənilər xalqımıza qarşı soyqırımları həyata keçiriblər. 1905-1907-ci illərdə, 1918-1920-ci illərdə ermənilər tərəfindən törədilmiş vəhşiliklər və 1992-ci ilin fevralın 25-dən 26-na keçən gecə baş vermiş dəhşətli Xocalı faciəsi xalqımıza qarşı məqsədli şəkildə törədilmiş soyqırımı aktlarıdır.



Bunlarla yanaşı, ADPU-nun Quba filialının kollektivi fevralın 26-da Quba rayon B.Səfəroğlu adına Mədəniyyət Evində Xocalı faciəsinə həsr edilmiş ümumrayon tədbirində və Quba Soyqırımı Memorial Kompleksinə doğru keçirilmiş ümumrayon yürüşündə iştirak ediblər.

# ADPU-nun Zaqatala filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş elmi-praktik konfrans keçirilib

Fevral ayının 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Zaqatala fillialında XX əsrin ən qanlı faciələrindən biri olan Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş "Gözlərinin yaşını sil, Xocalı!" adlı elmi-praktik konfrans keçirilib. ADPU-nun Zaqatala filialının direktoru, fizika-riyaziyyat elmləri doktoru, professor Orucəli Rzayev elmi-praktik konfransı giriş sözü ilə açıb. Xocalı soyqırımı qurbanlarının, Qarabağ müharibəsi şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Professor O.Rzayev çıxışında ermənilərinin tarix boyu azərbaycanlılara qarşı həyata keçirdikləri etnik təmizləmə və soyqırımı siyasəti haqqında konkret faktlar əsasında danışıb.





Sonra ADPU-nun Zaqatala filialının Humanitar fənlər və tədrisi metodikası kafedrasının müdiri Qüdrət Qırtımov "Xocalı soyqırımı bəşəriyyətə və insanlığa qarşı yönəldilmiş ən dəhşətli cinayətdir" mövzusunda geniş məruzə ilə çıxış edib. Məruzəçi Q.Qırtımov bildirib ki, erməni şovinistlərinin əsas məqsədi Dağlıq Qarabağı və digər Azərbaycan torpaqlarını ələ keçirmək, xalqımızın müstəqillik əzmini qırmaq idi. Lakin Azərbaycan xalqı sınmadı, əyilmədi, öz azadlığı yolunda inamla addımladı. Xocalı faciəsinin acı nəticələrini hamı bilməli və daim yadda saxlamalıdır. Xocalı soyqırımı XX əsrin ən qanlı, ən dəhşətli faciələrindən biridir. Xocalı soyqırımı insanlığa, bəşəriyyətə qarşı yönəldilmiş ən ağır cinayətdir. Bu faciə dünyada baş verən Xatın, Xirosima, Naqasaki, Lidisa, Qradur soyqırımları qədər dəhşətlidir. Dünya ictimaiyyəti isə bu faciənin dəhşətlərinə göz yumur.

Tədbirdə çıxış edənlər ulu öndər Heydər Əliyevin Azərbaycanda yenidən hakimiyyətə gəlişindən sonra Xocalı faciəsinin əsl siyasi-hüquqi qiymətini almasından və bu dəhşətli hadisələrin dünya ictimaiyyətinə çatdırılmasından ətraflı danışıblar.

Tədbirdə tələbə-gənclərin iştirakı ilə "Gözlərinin yaşını sil, Xocalı" adlı ədəbi-bədii kompozisiya və Xocalı faciəsinin dəhşətlərini əks etdirən film nümayiş etdirilib. Qeyd edək ki, digər təhsil müəssisələrində olduğu kimi, ADPU-nun Zaqatala filialında da ilk dərs saatları Xocalı soyqırımına həsr edilib.

# ADPU-nun Qazax filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş anım mərasimi keçirilib

24 fevral 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qazax filialının Heydər Əliyev auditoriyasında Xocalı soyqırımının iyirmi dördüncü ildönümü ilə əlaqədar anım mərasimi keçirilib. ADPU-nun Qazax filialının direktoru, dosent Afaq Qasımova anım mərasimini giriş sözü ilə açıb. Sonra Xocalı faciəsinin qurbanları bir dəqiqəlik sükutla anılıb. ADPU-nun Qazax filialının direktoru,



dosent A.Qasımova Xocalı faciəsinin səbəblərindən, həmin gecə Xocalıda baş verən dəhşətli soyqırımından və bu soyqırımın dünyada tanıdılması üçün görülən işlərdən danışıb. Anım mərasiminin iştirakçılarına Xocalı faciəsini bütün dəhşətləri ilə əks etdirən slayd təqdim edilib.

ADPU-nun Qazax filialının direktor müavini, dosent Məmməd Yusifov Xocalı dəhşətlərini özündə əks etdirən məlumatları tədbir iştirakçılarının diqqətinə çatdırıb. Dosent M.Yusifov xalqın taleyində belə dəhşətli faciənin bir daha təkrarlanmaması üçün tarixdən ibrət götürməyin zəruri olduğunu qeyd edib. Kafedra müdiri, fəlsəfə doktoru İradə Arıxova Xocalı faciəsinin ədəbiyyatımızada əks olunması barədə maraqlı çıxış edib. Tələbə-gənclərdən Aysel Kazımzadə "Xocalı faciəsini unutmayacağıq", Ləman Hacıyeva "Xocalını tanıdaq", Şəfiqə Zeynalova "Xocalı qan yaddaşımızdır", Jalə Bayramova "Xocalı soyqrımı dünya mətbuatında", Nərmin Qocayeva "Əsrin faciəsi-Xocalı", Günel İsmayılzadə " Xocalı şəhidləri" mövzularında çıxışlar ediblər.

# ADPU-nun Şamaxı filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr olunmuş silsilə tədbirlər keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr olunmuş tədbirlər planına əsasən silsilə tədbirlər keçirilib. Belə ki, ADPU-nun Şamaxı filialının kitabxanasında fevral ayının əvvəlində faciənin dəhşətlərini əks etdirən guşə, fotostend hazırlanıb, 24 fevral tarixində faciə qurbanlarının xatirəsinə həsr olunmuş "Xoca" filmi nümayiş etdirilib, 25 fevral tarixində "Xocalı soyqırımı-bəşəri cinayətdir" mövzusunda dəyirmi masa keçirilib, 26 fevral tarixində isə bütün tədris qruplarında ilk dərs saatı Xocalı faciəsinə həsr olunub.




"Xocalı soyqrımı-bəşəri cinayətdir" mövzusunda keçirilən dəyirmi masada əvvəlcə Xocalı hadisələrini əks etdirən film nümayiş olunub, şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. ADPU-nun Şamaxı filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova tədbiri giriş sözü ilə açaraq bildirib ki, biz bu gün əsrlər boyu xarici təcavüzlərə məruz qalmış, lakin tarixin bütün sərt sınaqlarından üzüağ çıxmış Azərbaycan xalqının qədim tarixinin ən qanlı, ən faciəli günlərindən birinin növbəti ildönümünü qeyd edirik. 24 il bundan öncə, 1992-ci ilin fevral ayının 25-dən 26-na keçən gecə Azərbaycanımızın ən dilbər guşəsi Qarabağımızın bir hissəsi olan Xocalımız üçün ən faciəli gecə oldu.

Xocalıda törədilmiş amansız qətliam nəinki Türk dünyasına, bütövlükdə bəşəriyyətin mütərəqqi dəyərlərinə, insanlığa və beynəlxalq hüquq normalarına qarşı yönəlmiş genosid aktıdır.

Ulu öndər Heydər Əliyevin 1993-cü ilin iyununda xalqın təkidli tələbi ilə yenidən hakimiyyətə qayıdışından sonra bir çox milli faciələrimiz kimi Xocalı soyqırımına da siyasi-hüquqi qiymət verilib. 1996-cı il fevralın 24-də xocalılarla görüşən ulu öndər Heydər Əliyev bu faciənin xalqımızın tarixində xüsusi yeri olduğunu vurğulayıb. Bu, bir tərəfdən hər bir Xocalı sakininin öz torpağına, millətinə, Vətəninə sədaqətinin nümunəsidir, ikinci tərəfdən də ermənilər tərəfindən Azərbaycana edilən soyqırımıdır, vəhşiliyin görünməmiş bir təzahürüdür. Ümummilli Liderin təşəbbüsü ilə Milli Məclis 1994-cü il fevralın 24-də "Xocalı Soyqırımı Günü haqqında" xüsusi qərar qəbul edib və bu sənəddə hadisənin başvermə səbəbləri, günahkarlar təfsilatı ilə açıqlanıb. Ümummilli Liderimizin "Xocalı soyqırımı qurbanlarının xatirəsinə sükut dəqiqəsi elan edilməsi haqqında" 25 fevral 1997-ci il tarixi sərəncamı ilə hər il fevral ayının 26-da saat 17:00-da Azərbaycan Respublikasının ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsi ehtiramla yad edilir.

Tədbirdə Xocalı hadisələrinin şahidi, polis polkovnik-leytenantı, ədliyyə müşaviri Hafiz Ədilov çıxış edərək yaddaşlardan silinməyən Xocalı soyqırımı haqqında danışıb. O, bildirib ki, erməni təcavüzkarlarının xalqımıza qarşı törətdiyi növbəti kütləvi qırğın nəticəsində 613 nəfər, o cümlədən 106 qadın, 63 uşaq, 70 qoca amansızlıqla qətlə yetirilib, 487 nəfər şikəst olub, 1275 dinc sakin əsir götürülüb, 155 nəfərin taleyi isə hələ də məlum deyil. Bu soyqırımı aktı nəticəsində 8 ailə tamamilə məhv edilib, 25 uşaq hər iki valideynini itirib.

Humanitar və xüsusi fənlər kafedrasının baş müəllimi Fəxrəddin Məmmədov çıxış edərək erməni hərbiçilərinin, daşnaklarının XIX-XX əsrdə törətdikləri qətliamlar arasında xüsusi amansızlığı ilə seçilən Xocalı faciəsinin insanların qanlarını damarlarında donduracaq qədər dəhşətli olduğunu bildirib.

Tələbələrdən Nərmin Maqsudova, Gültən Söhbətli, Fatimə Kamallı çıxış edərək Xocalı faciəsinə bir gənc kimi münasibət bildiriblər. Onlar qeyd ediblər ki, faciə qurbanlarının xatirəsi əbədi olaraq hər bir gəncin qəlbində kök salıb.

Tədbirin sonunda tələbələrin ifasında təqdim olunan şeir kompozisiyası tədbir iştirakçılarını daha da təsirləndirib.

# ADPU-nun Qazax filialı Qazax şəhəri 4 nömrəli tam orta məktəbdə “Xocalını unutmayaq!” adlı anım tədbiri keçirib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qazax filialının təşəbbüsü və təşkilatçılığı ilə fevral ayının 24-də Qazax şəhəri 4 nömrəli tam orta məktəbdə Xocalı soyqırımının iyirmi dördüncü ildönümü ilə əlaqədar “Xocalını unutmayaq!” adlı anım tədbiri keçirilib. Tədbirdə Qazax Rayon İcra Hakimiyyəti (RİH) başçısının müavini Gülayə Həsənova da iştirak edib. ADPU-nun Qazax filialının direktoru, dosent Afaq Qasımova tədbiri giriş sözü ilə açıb. Direktor A.Qasımova ADPU-nun Qazax filialının 4 nömrəli tam orta məktəblə birlikdə keçirdiyi belə tədbirlərin artıq ənənə halını aldığını bildirib. Qeyd edib ki, hər il olduğu kimi, bu il də III və IV kurs tələbələri müvafiq olaraq şəhərin 1, 2 və 4 nömrəli tam orta məktəblərində pedaqoji təcrübə keçirlər. Bu mənada anım tədbirimizin 4 nömrəli məktəbdə keçirilməsi təsadüfi deyil.



Direktor A.Qasımova çıxışında Xocalı faciəsinin dəhşətlərindən və tarix üçün ibrət dərslərindən danışıb. Bildirib ki, istər tələbələr, istərsə də şagirdlər xalqın taleyində baş vermiş belə faciələrlə bağlı kifayət qədər məlumata malik olmadırlar.

Anım mərasimində çıxış edən Qazax RİH-in başçısının müavini Gülayə Həsənova ADPU-nun Qazax filialının Xocalı soyqırımının iyirmi dördüncü ildönümü ilə əlaqədar anım mərasimini 4 nömrəli tam orta məktəbdə keçirməsini müsbət hal kimi qiymətləndirib, məktəb şagirdlərinin bu faciə barədə daha məlumatlı olmaları üçün belə tədbirlərin keçirilməsinin zəruriliyini vurğulayıb.

Anım mərasimində ADPU-nun Qazax filialının baş müəllimi Mübariz Süleymanov “Xocalı faciəsi-səbəblər və nəticələr” mövzusunda tarixi materiallarla zəngin və yaddaqalan çıxış edib. Təcrübəçi tələbələrdən Kübra Əhmədli “Xocalıya gedən yol”, Şəfiqə Zeynalova “Xocalını unutmadıq”, Abuhəyat Əfəndi “İyirmi dörd il dinməyən acı-Xocalı soyqırımı”, Nuranə Bədirzadə “Yaddaşımızın qocalmayan Xocalısı”, Orxan Abuşov “Unutmadıq, unutdurmarıq”, 7-ci sinif şagirdi Gülnar Hüseynova “Xocalı faciəsi” mövzularında maraqlı çıxışlar ediblər. Sonda 7-ci sinif şagirdləri Nəzakət Şahquluyeva, Lətifə Abdullayeva, Gülər Alıyeva və Şahin Mustafayevin ifasında “Azərbaycan” şeiri səslənib.

# ADPU-nun Ağcabədi filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr olunmuş elmi-praktik konfrans keçirilib

25 fevral 2016-cı il tarixdə ADPU-nun Ağcabədi filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr olunmuş “Xocalı soyqırımı XX əsrin faciəsidir” mövzusunda elmi-praktik konfrans keçirilib. Konfransda əvvəlcə Xocalıda və bütövlükdə Qarabağ uğrunda gedən döyüşlərdə şəhid olmuş soydaşlarımızın əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun Ağcabədi filialının direktoru, dosent Mətanət Fərzəliyeva konfransı giriş sözü ilə açaraq Xocalı faciəsi haqqında danışıb və bildirib ki, o dəhşətli gündən iyirmi dörd il ötür. Erməni silahlı qüvvələri uzun sürən mühasirədən sonra 26 fevral 1992-ci ildə xaricdəki havadarlarının hərbi yardımı ilə Xocalı şəhərini yerlə-yeksan etdi. Köməksiz mülki əhali amansızlıqla qətlə yetirildi. Hətta südəmər körpələrə, əlsiz-ayaqsız qocalara, qadınlara, uşaqlara belə aman verilmədi. Yüzlərlə adam əsir götürülərək dəhşətli işgəncələrə və görünməmiş təhqirlərə məruz qaldı. Azərbaycan xalqına qarşı yönəldilmiş Xocalı soyqırımı ağlasığmaz qəddarlığı və qeyri-insani cəza üsulları ilə tayı-bərabəri olmayan vəhşilik aktı kimi insanlığa qarşı tarixi bir cinayətdir. Bu gün dünyanın bir çox ölkələrində Xocalının günahsız qurbanlarının əziz xatirəsi ehtiramla yad edilir.



Konfransda “Xocalı soyqırımı bəşəriyyətə və insanlığa qarşı cinayətdir” mövzusunda məruzə edən ADPU-nun Ağcabədi filialının dosent əvəzi Tahir Kərimli 26 fevral 1992-ci ildə baş vermiş bu faciənin ən kiçik məqamlarına qədər konfrans iştirakçılarının nəzərinə çatdırıb. O, qeyd edib ki, ermənilərin Xocalıya qarşı hücum planı faciənin törədildiyi vaxtdan çox illər əvvəl hazırlanmışdı. Xocalı əvvəlcə iqtisadi, sonra isə hərbi blokadaya salınaraq tamamilə Yer üzündən silinməli idi.

Məruzəçi Xocalı şəhərinin müdafiəçiləri arasında şəxsən tanıdığı Milli Qəhrəmanlarımız Tofiq Hüseynov və Əlif Hacıyevin fədakarlıqlarından danışıb, son damla qanlarına qədər Xocalını müdafiə edən belə oğulların müqəddəs ruhları qarşısında baş əydiyini bildirib.

Məruzəçi T.Kərimli onu da bildirib ki, vaxtilə Xocalıda dəhşətli qətliamı törədənlər bu gün yüksək vəzifələrdə çalşaraq dünya ictimaiyyətinin qarşısına çıxırlar. S.Sarkisyan və S.Ohanyan dünyanın ən böyük faciəsi olan Xocalı faciəsinin iştirakçıları olaraq ədalət məhkəməsində ittiham olunmaq yerinə, yüksək tribunalarda öz iyrənc əməllərinə haqq qazandırmaqla məşğuldurlar.

Xocalı faciəsi öz mahiyyəti, miqyası etibarilə dünyada baş verən faciələrin daha dəhşətlisidir. Bu, faciə təkcə Azərbaycan xaqlının faciəsi deyil, bəşəriyyətin, insanlığın faciəsidir.

Xocalı faciəsinin dəhşətlərini lentə köçürən telejurnalist, Milli Qəhrəmanımız Çingiz Mustafayevin adını xüsusi ehtiramla yad edən məruzəçi qeyd edib ki, bu gün xalqımızın düşmənin əməllərini dünya ictimaiyyətinə çatdırmasında həmin fotoşəkillər, videolentlər mühüm rol oynayır.

Növbəti məruzə üçün söz filialın baş müəllimi Araz Əliyevə verilib. “Azərbaycanlıların soyqırımının Xocalı səhifəsi” mövzusunda məruzə edən A.Əliyev Xocalının tarixi keçmişindən danışıb və bu torpaqların əcdadlarımızın orta tunc dövründə yaşayış məskəni olduğunu dəqiq faktlarla sübuta yetirib. Məruzəçi Gülüstan və Türkmənçay sülh müqavilələrindən sonra Azərbaycan ərazisində yerləşdirilən ermənilərin zaman keçdikcə “Böyük Ermənistan” xülyası ilə yaşadıqlarını və bu yolda hər cür çirkin əməllərə imza atmalarını tarixi faktlar əsasında açıqlayıb. Ermənilərin bir-birinin ardınca törətdikləri qırğın və faciələrdən danışan A.Əliyev bildirib ki, Xocalı faciəsi tarixən yaşanmış faciələrimizin bir səhifəsi olmaqla, daha dəhşətli və ağlasığmazdır. Xocalıda əsir düşənlərin bir çoxunun aqibəti hələ də bilinmir və dünya birliyi bu ədalətsizliyə göz yumur. Biz yalnız o zaman mənəvi rahatlıq tapa bilərik ki, Vətənimizi erməni tapdağından təmizləyək və zəfər bayrağımızı Şuşada, Xankəndidə və Xocalının səmasında dalğalandıraq. Buna görə də biz Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin ətrafında sıx birləşməliyik.

“Xocalı soyqırımı-qan yaddaşımız” mövzusunda çıxış edən filialın tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanov bildirib ki, Xocalı soyqırımı bəşər faciəsi olmaq etibarilə yaddaşlardan heç vaxt silinməyəcək. Doğrudur, dünya dövlətləri hələ də bu faciəyə ikili standartlarla yanaşırlar. Lakin gün gələcək, bu faciənin dəhşətlərini hər bir xalqın nümayəndəsi yaxşı anlayacaq. Azərbaycan Prezidenti cənab İlham Əliyevin apardığı məqsədyönlü siyasət, Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyeva və Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın Xocalı həqiqətlərinin dünyaya tanıdılması yönündə apardıqları əməli fəaliyyət belə deməyə əsas verir.

Çıxışının sonunda dosent S.Süleymanov dünya ictimaiyyətini ikili mövqedən danışmamağa, xalqımızı ölkə rəhbərliyinə daha da yaxın olmağa və gənclərimizi vətənpərvərlik ruhunda tərbiyə olunmağa çağırıb.

Sonra məruzə ətrafında çıxışlar dinlənilib.

ADPU-nun Ağcabədi filialının Pedaqoji fakültəsinin tələbələri-Eltac Fərzəliyev, Anar Adıgözəlov, Ülviyyə Nurməmmədova, Gültac Şirinov, Aytac Məmmədova məruzə ətrafında çıxış edərək gəncliyin coşqun ruhunu, düşmənə qarşı barışmaz mövqeyini və Vətəninə, xalqına bağlılığını bir daha ifadə ediblər.

Konfransda ölkə Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi ilə Azərbaycanın sülh yolu ilə beynəlxalq hüququn norma və prinsipləri əsasında tezliklə ərazi bütövlüyümüzü bərpa edəcəyi fikri xüsusi vurğulanıb.

# ADPU-nun Şəki filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş elmi-nəzəri konfrans keçirilib

25 fevral 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında “Xocalı soyqırımı yaddaşlarda” mövzusunda elmi-nəzəri konfrans keçirilib. Elmi-nəzəri konfransda ADPU-nun Şəki filialının rəhbərliyi, professor-müəllim heyəti və tələbələri iştirak ediblər.



“Xocalı soyqırımı yaddaşlarda” mövzusunda elmi-nəzəri konfransı giriş sözü ilə ADPU-nun Şəki filialının elmi işlər üzrə direktor müavini, dosent N.Çələbiyev açıb. Əvvəlcə Xocalı faciəsi qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Humanitar elmlər kafedrasının baş müəllimi Tahir Məhərrəmov “Xocalı soyqırımı-XX əsrin dəhşətli faciəsi”, baş müəllimi Mirvari Eminova “Xocalı soyqırımı tarixi yaddaşlarda əbədi bir faciədir”, baş müəllim Həbibullah Manaflı “Dünya ictimaiyyəti Xocalı soyqırımını tanımaqdadır” və Humanitar elmlər kafedrasının müəllimi Aygül Cavadova “Xocalı faciəsini unutmadıq, unutmarıq” mövzusunda çıxışlar ediblər.

# ADPU-nun Cəlilabad filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş anım tədbiri keçirilib



25 fevral 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad filialında Xocalı soyqırımının iyirmi dördüncü ildönümünə həsr edilmiş anım tədbiri keçirilib. Tədbirdə Cəlilabad Rayon İcra Hakimiyyətinin (RİH) əməkdaşları L.Hüseynov, V.Əsgərov, Azərbaycan Respublikasının İnsan Hüquqları üzrə Müvəkkilinin (Ombudsman) Cəlilabad rayonu üzrə regional aparatının rəhbəri Z.İsmayılov, ADPU-nun Cəlilabad filialının tədris və elmi işlər üzrə direktor müavini E.Məmmədov, fakültə dekanı M.Rəhimova, əməkdaşları və tələbələri iştirak ediblər.

Tədbiri giriş sözü ilə ADPU-nun Cəlilabad filialının direktor müavini E.Məmmədov açıb. Əvvəlcə Xocalı faciəsi qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib. E.Məmmədov ötən əsrin 90-cı illərində Vətənimizin başına gətirilən faciələrdən, həmin dövrün iqtidarının səriştəsiz siyasətinin nəticəsi olaraq xalqımızın və dövlətimizin yaşadığı problemlərdən danışıb.

Sonra söz Cəlilabad RİH-in nümayəndələrinə verilib. Onlar da öz növbələrində Xocalı soyqırımının dəhşətlərindən danışıblar. Qeyd ediblər ki, Azərbaycan xalqına qarşı yönəldilmiş Xocalı soyqırımı öz ağlasığmaz qəddarlığı və qeyri-insani cəza üsulları ilə bəşər tarixində tayı-bərabəri olmayan bir vəhşilik aktıdır. Bu soyqırımı eyni zamanda bəşəriyyətə qarşı yönəldilmiş bir cinayətdir. Biz vəhşicəsinə öldürülmüş, işgəncələr verilmiş, şikəst edilmiş həmvətənlərimizin xatirəsi önündə baş əyirik. Erməni quldurlarının xalqımıza qarşı törətdiyi Xocalı soyqırımını heç zaman unutmayacağıq.

ADPU-nun Cəlilabad filialının dekanı M.Rəhimova isə çıxışında xalqımızı birliyə çağırıb və düşmənə qarşı mübariz olmağa səsləyib. Sonra Xocalı soyqırımını əks etdirən sənədli film nümayiş etdirilib, tələbə-gənclərin ifasında şeirlər səslənildirilib.

# Nitq mədəniyyəti barədə - II yazı

Səs, məhz ictimai mahiyyətli danışıq səsi nitqin fonetik parçasının ən kiçik həlqəsidir. Həm də vacib və əhəmiyyətli həlqəsidir. Bu həlqə fəsadlı olduqda səs, məhz ictimai mahiyyətli danışıq səsi insanları yorur. İnsanın beyninə elə zərbə vurur ki, nəticədə baş ağrıları, qıcıqlandırıcı hərəkətlər, insanı özündən çıxaran münasibətlər yaranır. Təsadüfi deyil ki, el arasında belə deyimlər var: "Musiqi can dərmanıdır", yaxud "Filankəsin səsi başıma düşür". "Filankəsin səsi başıma düşür" deyəndə küçələrdə, avtobus dayanacaqlarında, ictimai nəqliyyat vasitələrində, bazarlarda və s. yerlərdə nitq mədəniyyətinin səviyyəsi yada düşür. Hər birimiz küçələrdən keçərkən, eləcə də avtobus dayanacaqlarında gözləyərkən maşınların salonundan ətrafa yüksək səsli musiqilərin yayıldığının şahidi olmuşuq və oluruq. Belə musiqi səsləri ətrafdakı insanların əhval-ruhiyyəsinə pis təsir etsə də, həmin musiqini ətrafa yayanlar buna heç məhəl də qoymurlar. Həmin musiqini ətrafa yayanlar nəzərə almırlar ki, onlar bu əməlləri ilə insanların səhhətinə mənfi təsir göstərirlər.



Belə bir reallıq da var. Bəzən küçə musiqiçiləri ilə qarşılaşırıq ki, onların fəaliyyəti xaosdan ibarət olan musiqidən qat-qat effektli olur. Müasir dövrdə küçə musiqiçiləri Avropa ölkələrində özünə daha geniş yer alıbdır. Hətta Avropada, Amerikada, xüsusilə Latın Amerikası ölkələrində bu sahə tam təşəkkülünü tapıb. Bir sıra peşəkar musiqiçilər öz karyerasına küçə musiqisi ilə başlayıb. Parklarda, küçələrdə musiqi ifa etməklə peşəkar musiqidə öz karyeralarını qurublar. Yəni parkda, küçədə canlı ifa olunan küçə musiqisi xaosdan ibarət musiqidən daha effektlidir. Heç zaman xaos xarakterli musiqilər cəmiyyətin mənəvi tələbatına çevrilmir.

Nitq mədəniyyətinin formalaşmasına mənfi təsir göstərən belə amillər ictimai mahiyyətli danışıq səsi, eləcə də musiqi səsi barədə görüşləri pis bir məcraya yönəldir. Xaos xarakterli və məzmunlu səsləri nə qədər dinləmək olar?! Hətta musiqinin insan orqanizminə xeyirli olmasına baxmayaraq "Musiqi can dərmanıdır" deyərək bütün günü musiqi də dinləmək olmaz. Araşdırmalar təsdiq edir ki, insan gündə bir saatdan çox musiqiyə qulaq asmamalıdır. Məsələn, Ümumdünya Səhiyyə Təşkilatının belə bir məsləhəti düşündürücüdür: "Eşitmə qabiliyyətlərini qorumaq üçün adamlar gündə bir saatdan çox musiqiyə qulaq asmamalıdırlar". (bax: Təranə Məhərrəmova. Yüksək səs - həyatımızın yeni bəlası. "Kaspi" qəzeti, 4 mart 2015, 041 (3352), s.9) Əks təqdirdə musiqiyə həddindən çox qulaq asanlar və həddindən artıq bərkdən dinləyənlər, xüsusilə gənclər (təqribən1,1 milyard gənc) eşitmə üzvlərinə həmişəlik ziyan vura bilərlər.

Müasir dövrdə insanların sağlamlığına konsertlər, barlar, toylar, şənliklər də ziyan vurur. Ona görə ki, belə yerlərdə musiqinin akustikası insana ciddi təhlükə yaradır. Musiqinin akustikası normal tonda olmadığı üçün insanın qulağını zədələyir. Onu da qeyd edək ki, hazırda dünyada gedən proseslər bir-birini təkrarlayır. Nitq mədəniyyətinə ziyan vuran gerçəkliklər dünyanın hər yerində eynidir. Belə ki, Ümumdünya Səhiyyə Təşkilatının verdiyi məlumata görə, audio-pleyerlər, konsertlər, barlar sağlamlıq üçün ciddi təhlükə yaradır və bunun nəticəsidir ki, 12-35 yaş arasında olan 43 milyon adamın eşitmə qabiliyyəti zəifdir, həm də bu rəqəmin sayı getdikcə artır.

Müasir dövrdə qulaqcıqlardan istifadə edənlərin sayı çoxalıb. Onlar qulaqcıqdan ictimai nəqliyyatda, küçələrdə, hətta iş otaqlarında istifadə edirlər. Müntəzəm şəkildə qulaqcıqdan istifadə etmək qulağın akustik zədə almasını tezləşdirir. Nəticədə karlaşmanın yaş həddi cavanlaşır. Statistik məlumata görə, Rusiyada karlaşma 30-40 yaşında başlayır. Halbuki əvvəllər karlaşmanın yaş həddi 70-dən sonra başlayırdı. Gənclərin musiqini yüksək səslə dinləməsi nəticə etibarilə qulaqların zədələnməsinə meydan açır. Belə ki, yüksək musiqi səsi qulaqda küy yaradır. Bu da qulaq pərdəsini zədələyir. Həm də qulağın qəbul etdiyi səs nəticə etibarilə beyinə ötürülür. Akustik baxımdan küylü olan səs beyində xoşagəlməyən reaksiya yaradır. Beləliklə, nitq mədəniyyətinin ən ibtidai vahidi olan səs öz akustik təbiətini təqdim edə bilmir. İnsanlar səsin təbii mahiyyətini deyil, süni yolla yaradılmış akustikasını dinləməli olurlar. Bu da yenə də insanlarda nitq mədəniyyətinin formalaşmasına mənfi təsir göstərir. Səsin fiziki, fizioloji və akustik cəhətləri həddini aşdıqda o, beyində də xoşagəlməyən reaksiya yaradır. Psixoloqların və pedaqoqların bu məsələyə yanaşmaları da deyilənləri təsdiq edir. (bax: Təranə Məhərrəmova. Yüksək səs - həyatımızın yeni bəlası. "Kaspi" qəzeti, 4 mart 2015-ci il, 041 (3352), s.9) İnsan qulağı təbii olaraq ətraf aləmdə olan səsləri qəbul edir, onları bir-birindən fərqləndirir. Yəni insan ətraf aləmdəki səslərlə ünsiyyətdə olur. Bu ünsiyyət isə təbiilikdən kənarda deyil, təbii şəkildə qurulur. Ancaq qulaqcıq vasitəsilə yaxın məsafədən qulağa təsir edən səslər (musiqi səsləri) təbii yolla deyil, süni yolla yaranan ünsiyyətdir.

"Yüksək səs - həyatımızın yeni bəlası" kimi ictimai-sosial problem olmaqla mütəxəssisləri düşündürür. Mütəxəssislər müntəzəm olaraq qulaqcıqla yüksək tonlu musiqinin dinlənilməsini ziyanlı hesab edirlər. Bu, o demək deyildir ki, bütövlükdə musiqi insan sağlamlığına ziyandır. Belə deyildir. Normasında musiqi dinləmək, daha çox klassik musiqini dinləmək insanda sakitlik yaradır. Məsələn, Bethovenin, Motsartın musiqisini dinləmək insanlara rahatlıq, sakitlik gətirir. Yaxşı musiqi səsi insan orqanizminə müsbət təsir göstərir, insanı müalicə edir. Səsin orqanizmə bu cür müsbət təsiri səs terapeyası kimi də başa düşülür. Təsadüfi deyil ki, hələ qədim dövrlərdə bir sıra xəstəlikləri səslə (musiqi səsi ilə) müalicə etmişlər. Məsələn, misirlilər, yunanlar musiqi səsi ilə xəstələri müalicə etmiş, onları sağlam həyata qaytarmışlar. Yaxşı musiqi səsi yalnız insanın əhval-ruhiyyəsinə deyil, həm də onun orqanizmindəki orqanların bioloji fəaliyyətinə də müsbət təsir göstərir. Aparılan tədqiqatların nəticələri sübut etmişdir ki, musiqi alətlərinin səslərinin orqanizmə təsiri, məhz müsbət təsiri az deyildir. Ancaq musiqi alətlərinin səsini məqamında, yerində dinləmək lazımdır. Məsələn, mütəxəssislərin fikrincə, simli musiqi alətlərinin səsinə günortaya yaxın 11-13 radələrində qulaq asmaq effektli olur. Elə musiqi alətləri var ki, onların səsi insan orqanizmində müəyyən orqanların fəaliyyəti üçün faydalıdır. Məsələn, dilli musiqi alətlərinin səsi mədə-bağırsaq sistemi üçün əhəmiyyətlidir. Belə ki, səhər 7-9 radələrində dilli musiqi alətlərinin səsini dinləmək effekt verir və faydalı olur. Mütəxəssislər sübut edirlər ki, böyrəklərində problem olan insanlar axşamçağı 17-19 radələrində saksafonun səsinə qulaq assalar, böyrəklərin fəaliyyəti yaxşılaşa bilər. Tədqiqatçılar onu da sübut edir ki, gecə saat 1-dən sonra həzin fleyta səsi qaraciyərin, yatmazdan bir-iki saat qabaq qaboy musiqisini dinləmək öd kisəsinin fəaliyyətinə yardımçı olur. Bir sözlə, təbabətdə sübut olunmuşdur ki, müxtəlif növ depressiyaları, əsəb xəstəliklərini müalicə etməkdə musiqinin, xüsusilə klassik musiqinin faydası böyükdür. Ancaq bununla belə, insanın sağlamlığına müsbət təsir göstərən səs insanın səsidir. İnsan xoş niyyətlidirsə, qarşı tərəfə sevgisi, məhəbbəti, istəyi varsa, onun səsi məlhəmdir. Bəzən el arasında deyirlər ki, filankəsin səsi başıma düşür. Bu, ona görə belədir ki, filankəsin səsi sevgi, məhəbbət, istəklə nəfəs almır. Yəni onun səsi də, özü də arzuolunan deyildir. Səs, doğrudan da, fərdidir və fərqlidir. İnsanların səsi bir-birindən seçilir, xüsusilə qadın və kişi səsləri fərqlidir. Ona görə də kişi aktyorlarımız qadın səslərini canlandırdıqda bu, tamaşaçı zövqünü oxşamır. Hər biri - kişi də, qadın da öz rolunda olmaqla orijinallığı qoruyur. Deməli, səs orijinallığın ölçüsüdür, göstəricisidir. Səsin orijinallığını xarakterizə edənlər onu müxtəlif qruplara ayırıblar. Məsələn, Yuri Borisoviç Levitana görə, iki səs qrupu var: polad səs və gözəl, məxmər səs. Xalq artisti, diktor Sabir Ələsgərovun dediklərinə görə, keçmişdə diktorlar, aparıcılar, rejissorlar, redaktorlar, operatorlar Moskvada təcrübə keçmək üçün bir aylıq, iki aylıq, altı aylıq, bir illik kurslarda olarmışlar. Onlar bu kurslarda ən təcrübəli diktorlardan öyrənər və nəticədə xeyli təkmilləşərmişlər. Belə kurslarda, təbii ki, S.Ələsgərov da iştirak edir. S.Ələsgərov iki aylıq kursların birində Yuri Borisoviç Levitanın tələbəsi olur. Məhz onda Y.B.Levitan iki səs qrupunun olduğunu S.Ələsgərova deyir. Həm də S.Ələsgərovun səsini lentə yazdırıb təhlil edərkən ona deyir ki, səndə hər iki səs qrupu var. Sən həm dölət məlumatlarını oxuya bilərsən, həm də bədii verilişləri. Y.B.Levitan onu da S.Ələsgərova deyir ki, onun özü yalnız dövlət məlumatlarını oxuyubdur. Bədii verilişləri, şeirləri, bədii mətn parçalarını oxumaq onun səsinə uyarlı deyildir. Deməli, səsin orijinallığı imkan yaradır ki, diktor hansı məlumatları oxusun: dövlət məlumatlarınımı, yoxsa bədii məlumatlarımı (materiallarımı).

İnformasiya səsə elə köklənməlidir ki, səsin imkanları əsasında (səslənməsi, zövqü oxşaması, estetikası, gözəlliyi və s.) informasiya qarşı tərəfi təmin edə bilsin. Bəzən kifayət qədər ətraflı bir informasiya səsə köklənmədiyi üçün qarşı tərəfi təmin etmir. Ona görə də yaxşı diktorun, aparıcının, natiqin səsi Allah tərəfindən ona verilmiş ən qiymətli nemətdir. Belə qiymətli nemətə - səsə malik olan Xalq artisti, diktor S.Ələsgərovun dediklərinə görə, vaxtilə görkəmli şair Məmməd Aslanın "Ekran və efir" qəzetində çap etdiyi bir məqalə S.Ələgərovun səsinə həsr olunmuşdur. Məqalədə S.Ələsgərovun səsinin qeyri-adiliyi, bənzərsizliyi, tamaşaçı və dinləyici tərəfindən rəğbətlə qarşılandığı qeyd edilmişdir. Hətta M.Aslan onu da qeyd etmişdir ki, Bilgəhdəki sanatoriyada istirahət edən vaxt hamı bir-birinə, o cümlədən Məmməd Aslana deyirlərmiş ki, S.Ələsgərov da buradadır, istirahət edir. M.Aslan S.Ələsgərovu yaxından tanıdıqdan sonra ona demişdir ki, mənə deyəndə ki, S.Ələsgərov da Bilgəh sanatoriyasındadır, onda bunu çox qəribə qəbul edirdim. Ona görə ki, axı o, başqalarının yazdıqlarını təqdim edir, tamaşaçıya və dinləyiciyə çatdırır, o, başqasının sözünü deyir, öz sözünü demir ki. Ancaq M.Aslan onu da etiraf etmişdir ki, başqasının yazdıqlarını dinləyiciyə, tamaşaçıya çatırmaq daha çətindir. S.Ələsgərov isə televiziya müsahibələrinin birində deyir ki, mən başqalarının yazdıqlarını mənimsəyir, özümünküləşdirir, sonra isə dinləyiciyə və tamaşaçıya təqdim edirəm.

Səs informasiya daşıyıcısıdır. Səsin daşıdığı informasiya sevincli, kədərli, qorxulu vahiməli və s. ola bilər. Səs kodlaşmış informasiyanı daşıyır. Bu xarakterinə görə təbiətdəki və cəmiyyətdəki səslər bir-birindən fəqlənir. Bir-birinin eyni olan səs yoxdur. Küləyin səsi yağışın səsindən, yağışın səsi digər səslərdən fərqlənir. Ancaq səslər içərisində insana xidmət edən səs musiqi səsidir. Musiqi səsi insanlar tərəfindən yaradıldığı üçün o, insanın özünə də xidmət edir. Ancaq musiqi səsindən, musiqidən düzgün faydalanmaq lazımdır. Bütün günü musiqiyə qulaq asmaq ziyanlı və yorucudur. Təsadüfi deyil ki, keçmişdə radioda, televiziyada müvafiq vaxtlarda muğam, xalq havaları, saz havaları, konsertlər olurdu. Ancaq indi bəzi radio və televiziyaları nə vaxt açırsan, şou xarakterli və məzmunlu musiqidən başqa heç nəyi dinləmək və görmək mümkün olmur. Belə musiqinin hansı faydasından danışmaq olar?! Az qala bəzi radio və televiziya kanalları şou xarakterli və məzmunlu musiqi kanalına çevriliblər. İntellektual səviyyəli tamaşaçı, dinləyici belə şou musiqilərdən yorulub və bezibdir.

Səs olmasa, dünyanın özü əbədi kar xəstəliyinə tutulmuş görkəmdə olar. Səs dünyanın da, insanın da həm rahatlığı, həm də narahatlığıdır. Bu mənada musiqi insan üçün rahatlıq bəxş edən mənəvi qidadır. Ona görə də musiqiyə hər bir kəsin ehtiyacı var. Belə ki, insan xarakteri müəyyən xəstəliklərin yaranmasında heç də az rol oynamır. Məsələn, insanların xarakterində olan səbirsizlik, qibtə, nifrət, paxıllıq və s. hisslər beynin fəaliyyətini, düzgün ritmlərini pozan amillərdir. Ona görə də insanın xarakterindən irəli gələn xəstəliklərin qarşısını almaq üçün musiqiyə olan ehtiyacı mütləq nəzərə almaq lazımdır. Söhbət o musiqidən gedir ki, həmin musiqi insana rahatlıq gətirə bilsin, insanın səhhətini öz qaydasına sala bilsin. Bu mənada insanda bir sıra xəstəlikləri musiqi aradan qaldırır. Məsələn, xroniki yorğunluğu Bramsın musiqisi aradan qaldırmağa qadirdir. "Üçüncü simfoniya"nın üçüncü hissəsi, "Dördüncü simfoniya"nın birinci hissəsi, skripka ilə konsert, "Macar rəqsləri" orqanizmi həftə boyu enerji ilə təmin edir. Ona görə də bu musiqiləri bazar ertəsi səhər tezdən dinləmək orqanizm üçün faydalıdır. Yeri gəlmişkən qeyd edək ki, musiqini dinləməyin özü də bir mədəniyyətdir. Bəzən musiqinin əhəmiyyətinə və fərqinə varmayanlar bilmir ki, hansı musiqini dinləmək lazımdır. Əksinə, insan orqanizminə mənfi təsir edən musiqini dinləyənlər də az deyil. Onlar heç musiqinin fərqinə varmadan bu işi edirlər.

Musiqi dinləmək mədəniyyəti nitq mədəniyyətinin tərkib hissəi kimi başa düşülməlidir. Müsahibimizin bizi dinləməsini və bizim onu dinləməyimizi bir mədəniyyət saydığımız kimi, musiqini dinləməyi də belə hesab etməliyik. Lakin biz çox vaxt bu barədə düşünmürük və bunun heç fərqinə də varmırıq.

**Buludxan Xəlilov,**
**Filologiya fakültəsinin dekanı,**
**filologiya üzrə elmlər doktoru,**
**professor**

# ADPU-nun Zaqatala filialında "İslam və millilik" adlı tədbir keçirilib

Fevral ayının 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Zaqatala filialında Zaqatala Rayon İcra Hakimiyyətinin (RİH) və Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin (DQİDK) Zaqatala bölgəsi üzrə şöbəsinin birgə təşəbbüsü və təşkilatçılığı ilə "İslam və millilik" adlı tədbir keçirilib. ADPU-nun Zaqatala filialının müəllim və tələbələrinin iştirak etdiyi tədbiri filialın direktoru, professor Orucəli Rzayev açaraq mövzu-



nun aktuallığını tələbə-gənclərin nəzərinə çatdırıb. Professor O.Rzayev vurğulayıb ki, İslam dini ümumbəşəri, dünyəvi, sülh və əmin-amanlıq dinidir.

Tədbirdə çıxış edən DQİDK-nın Zaqatala bölgəsi üzrə şöbəsinin müdiri M.İsmayılov İslam və millilik tarazlığının qurulma-



sı, dinimizin milli adət-ənənələrə və dəyərlərə baxışı barədə məlumat verib. M.İsmayılov İslam və millilik münasibətlərinin düzgün nizamlanmasının əhəmiyyətindən danışıb. O, qeyd edib ki, İslam dini Allahın sonsuz mərhəmət və şəfqətinin Yer üzündə təcəlli etdiyi dinclik və barışıq dolu bir həyatı insanlara təqdim etmək üçün göndərilmiş bir dindir.

Sonra çıxış edən Zaqatala RİH-nin nümayəndəsi İlqar Vəliyev dini radikalizmin milli adət-ənənələr və dəyərlərlə ziddiyyət təşkil etməsindən və dini radikalizmə qarşı mübarizədə milli-mənəvi dəyərlərin rolundan danışıb.

Tədbirdə həmçinin ilahiyyət üzrə fəlsəfə doktorları Rafiz Manafov və Asəf Qənbərov İslami dəyərlərin milli dəyərlərin formalaşmasındakı rolu, dini-milli dəyərlərin ümumbəşəri dəyərlərlə qarşılıqlı əlaqəsi və milli dəyərlərimizin Azərbaycan multikulturalizminə töhfələri barədə geniş məruzə ediblər.

# ADPU-nun Şamaxı filialında 21 Fevral-Beynəlxalq Ana Dili Gününə həsr edilmiş "Dilimizi qoruyaq!" adlı dəyirmi masa keçirilib

19 fevral 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında 21 Fevral-Beynəlxalq Ana Dili Gününə həsr edilmiş "Dilimizi qoruyaq!" adlı dəyirmi masa keçirilib.

Tədbiri giriş sözü ilə ADPU-nun Şamaxı filialının tədris və elmi işlər üzrə direktor müavini Şasəddin Mikayılov açaraq bildirib ki, UNESKO-nun Baş Məclisində 21 Fevral-Beynəlxalq



Ana Dili Günü elan olunub və üzv ölkələrə tövsiyə edilib ki, həmin gün təhsil müəssisələrində ana dilinin əhəmiyyəti ilə bağlı tədbirlər, konfranslar, seminarlar keçirilsin.

Dünyada məhv olmaq təhlükəsi ilə üzləşən dillərin qorunması məqsədilə hər il keçirilən 21 Fevral-Beynəlxalq Ana Dili Günü hər kəsə öz doğma dilinin varlığını hiss etmək, onunla qürur duymaq, onu qorumaq, inkişaf etdirmək hüququ olduğunu bir daha xatırladır. Sadə dillə desək, dil ünsiyyət vasitəsidir, bununla yanaşı, dil xalqın, millətin simasını səciyyələndirən əsas amillərdən biridir. Dil hər bir xalqın milli varlığının təzahürü, onun sərvəti, qan yaddaşıdır.

Tədbirdə Dil-ədəbiyyat və onların tədrisi metodikası kafedrasının müəllimləri Məhəmməd Maqsudov, Bəhrəm Bağıyev, Əlistan Əkbərov, Vəsilə Razimi çıxış edərək ümummilli lider Heydər Əliyevin Azərbaycan dilinin inkişafındakı mühüm xidmətlərindən danışıblar. Çıxış edənlər ulu öndər Heydər Əliyevin həmişə doğma dilimizə göstərdiyi yüksək qayğı və diqqəti xüsusi vurğulayıbar. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev Azərbaycan dilinin inkişafına böyük qayğı və diqqət göstərir. Sonra ulu öndər Heydər Əliyevin və məşhur pedaqoqların dil haqqında kəlamları səsləndirilib.

Tədbirin sonunda tələbələrdən Leyla Mustafayeva, Gülnurə Dəmirzadə, Maya Hüseynova, Sədi İsrailov, Heyran Cavadzadə, Bibigül İsayeva və Şəbnəm Əbilova şeir kompozisiyası ilə çıxış ediblər.

# Səməd bəy Mehmandarov - nəsillərə örnək sərkərdə

(Əvvəli ötən sayımızda)

Ordu hissələrində milli köklərə bağlanmanı əks etdirən bayramlar, xüsusilə Novruz bayramının keçirilməsi təşkil edilirdi.

Cümhuriyyət ordusunda formalaşan milli-mənəvi dəyərlərdən biri də qoşun hissələrində milli hərbi şərqilərin yaradılması idi. AR MDA-də Cümhuriyyət ordusunun şərqiləri xüsusi qovluqda saxlanılır. (1)

Cümhuriyyət ordusunun şərqilərinin bir hissəsi Səməd bəyə həsr olunmuşdur. Şərqilərdə Səməd bəy sərkərdə və sərdar kimi vəsf olunur (5, səh.111-114). Bir nümunəyə nəzər salaq:

*Qafqazlılar əkbərimiz,*
*Səməd paşa sərdarımız.*
*Allah, Allah fəryadımız,*
*Qan axıdar xəncərimiz.*



S.Mehmandarova həsr edilmiş şərqilər. (5, səh.s.115)

Cümhuriyyət ordusunun sıralarında 27 general xidmət etmişdir. Onlardan bir neçəsinin adlarını xatırlamaq yerinə düşər: tam artilleriya generalı Səməd bəy Mehmandarov, tam artilleriya generalı Əliağa Şıxlinski, general-leytenant M.Sulkeviç (Baş Ərkani hərb rəisi), general-leytenant Tərxanov (istehkamat rəisi), general-mayor H.Səlimov (Ümumi qərargah rəisi), general-mayor S.Əfəndiyev (1-ci piyada diviziyasının komandiri), general-mayor Murad Gəray Tlexas (Topçu idarəsinin rəisi, Bakının general qubernatoru), general-mayor İ.Usubov (2-ci piyada diviziyasının komandiri), general-mayor T.Novruzov (süvari diviziyasının komandiri),general-mayor C.Şıxlinski (1-ci piyada diviziyasının komandiri), general-mayor Vəkilov (topoqrafiya şöbəsinin rəisi), general-mayor D.Yadigarov (1-ci piyada diviziyasının komandir müavini), general-mayor F.Vəzirov (Bakı şəhərinin komendantı) və s.(5, səh.281)

1919-cu ilin sonlarına doğru Azərbaycan ordusunda iki piyada və bir süvari diviziya var idi. Birinci piyada diviziyası Gəncədə (rəsi C.Şıxlinski idi), ikinci piyada diviziyası isə Bakıda yerləşirdi.

Süvari diviziyanın qərargahı Gəncədə yerləşirdi. Diviziyanın rəisi general-mayor Teymur Novruzov idi. Gəncədə, həmçinin 1-ci və 2-ci artilleriya briqadaları yerləşdirildi, yüngül toplara malik xüsusi diviziya formalaşdırıldı. Yaranmaqda olan hərbi hissələri zabit kadrlarla təmin etmək üçün Gəncədəki hərbi məktəb Bakıya köçürüldü. Şuşada hərbi feldşer məktəbi, hərbi dəmir yolu məktəbi təsis edildi.

1920-ci ildə ordunun şəxsi heyətinin sayının 40 minə çatdırılması planlaşdırılmışdı. Lakin ordunun silahı az idi. Azərbaycan hökuməti Fransa, Polşa, İngiltərə nümayəndələrinə müraciət etsə də, silah almaq baş tutmadı. İtaliya isə Azərbaycana avtomobil, aeroplan, projektor, odeyal və yataq dəstləri satdı.

**1920-ci ilin əvvəllərində Milli Ordunun 3 zirehli qatarı, 4 hərbi təyyarəsi, 6 zirehli avtomobili, 2 hərbi gəmisi var idi.**

1920-ci ilin əvvəllərində-Novruz bayramı ərəfəsində ermənilər Xankəndinə hücum etdilər. 16 zabit, xeyli əsgər şəhid oldu. Qarnizon rəisi general Qacar tezliklə müdafiəni təşkil edərək erməni dəstələrini Xankəndindən kənara atdı. Lakin ermənilər Əsgəranı ələ keçirə bildilər. Qarabağ süvari alayı, Cavanşir piyada alayı, artilleriya batareyası mühasirəyə alındı. Əsgəranı geri almaq üçün general Həbib Səlimovun komandanlığı altında hərbi hissələr Qarabağa göndərildi, döyüşlərin gedişində erməni hərbi dəstələrinin başçısı Dəli Qacar öldürüldü. Keşişkənd uğrunda döyüşlərdə Azərbaycan ordusu qələbə çaldı.

Qarabağ qiyamı yatırıldıqdan sonra ermənilər Dilican və Zəngəzura qoşun yeritdirlər. Bu hadisələrin parlamentdə müzakirəsində Ə.Qarayev Qızıl Ordunun dəvət edilməsini təklif etdi. Komandanlıq Antanta ölkələrinin xəbərdarlıq notasına əhəmiyyət verməyərək Samur çayı istiqamətindəki qoşun hissələrini Azərbaycanın qərbinə yeritdi. Ermənistan hökuməti aprelin 26-da barışıq təklif etdi.

Nəhayət, 72 minlik XI Qızıl Ordunun zirehli qatarlar qrupu aprelin 26-dan 27-ə keçən gecə Azərbaycan sərhəddini keçib Bakı üzərinə hücum etdi. Azərbaycan Ordusunun kiçik dəstələri Qızıl Ordunun qarşısını ala bilmədi.

İl yarım ərzində silahdaşı və dostu Əliağa Şıxlinski ilə 40 minlik ordu yaradan Səməd bəy - "yuxudan yenicə oyanmış xalqda sağlam milli hiss oyatmalıyıq", - deyirdi və bunu mübarizə tədbirlərindən biri hesab edirdi: "Biz heç vaxt boyunduruq altında olmamışıq". Bu sözlər əsgərləri ruhlandırırdı. Əsgərlər də onun şəninə "Qafqaziyaya şan gəlir, dərdlərə dərman gəlir" - deyə oxuyurdular. 1919-cu ilin yazında ingilis hərbi hissələri Azərbaycanda olduğu dövrdə Hərbi nazir S.Mehmandarov Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin başçısı Nəsib bəy Yusifbəyliyə göndərdiyi rəsmi məktubda bildirir ki, ingilis hərbi dəstələri Azərbaycanda məskun olduqları yerlərdə talanlar edir, kəşfiyyat işi aparırlar. Bunlara etiraz olaraq S.Mehmandarov İngiltərə hökumətinin Birinci Dünya müharibəsi illərində ona verdiyi ordenləri özlərinə qaytarmağı Azərbaycan hökumətindən xahiş edir.



General-mayor Murad Gəray Tlexas zabitlər arasında

1920-ci ilin əvvəllərində Milli Ordunun 3 zirehli qatarı, 4 hərbi təyyarəsi, 6 zirehli avtomobili, 2 hərbi gəmisi var idi. Bundan əlavə, Gəncədə 2 artilleriya batareyası və yüngül toplara malik xüsusi diviziya yaradılmışdı. Hərbi xidmətə 19-24 yaşlı müsəlman əhalisinə məxsus gənclərin çağırılması nəzərdə tutulurdu. Ordunu gücləndirmək üçün 5 tank, 12 hidroplan, 6 aeroplan, 9 zirehli avtomobil və s. alınması planlaşdırılmışdı. Ancaq öz millətinin ordu komandanı olmaq xoşbəxtliyi cəmi il yarım sürdü. Aprelin 27-də parlamentin son iclasından qayıdan Səməd bəy Mehmandarov ailə üzvlərinin çamadanları hazırlayıb yola çıxmaq istədiklərini görüb dedi: "Boşaldın, heç yerə gedəsi deyilik. Vətəndən ayrılmağa heç bir əsasım yoxdur". Biləcəridə Müsavat hökumətinin başçılarını Tiflisə aparan qatar Səməd bəy Mehmandarovu saat yarım gözlədi  O, Bakıda qaldı. Gedənlərin taleyi necə oldu, bunu da hamı bilir. Polkovnik Ə.Abbasov Səməd bəyin oğlu İqor Mehmandarova istinadən belə bir hadisəni təsvir edir: «S.Mehmandarov aprelin 27-də parlamentin iclasında iştrak etdi. Müsavat hökumətinin başçısı, xarici işlər naziri və dövlət çinovniklərindən bəziləri bankın qızıl ehtiyatlarını ələ keçirib Bakı stansiyasında hərbi naziri gözləyirdilər ki, respublikanı tərk etsinlər. Mehmandarov stansiyaya gəlmədi, parlamentin iclasından sonra öz evinə qayıtdı". (7, səh.136).

Aprel çevrilişindən sonra Ə.Şıxlinski bir müddət Hərbiyyə və Bəhriyyə komissarının müavini, daha sonra Komissarlığın hərbi rəhbəri oldu. 1920-ci il mayın sonlarında Gəncədə başlayan antisovet üsyanı yatırılan kimi çoxlu sayda Cümhuriyyət zabitləri ilə birlikdə S.Mehmandarov və Ə.Şıxlinski həbs edildilər. Məlumat var ki, Səməd bəyin həbsində C.İldırımın xüsusi rolu oldu (2, səh. 89). Səməd bəy iyunun 4-də FK tərəfindən həbs olundu, evində axtarış keçirildi. N.Nərimanov onlarla maraqlanmasaydı yəqin ki, güllələnəcəkdilər. N.Nərimanov iki generalı Moskvaya, Leninin sərəncamına göndərməklə onları Azərbaycanda mövcud olan təhlükədən uzaqlaşdıra bildi. Bunun üçün Leninə məktub yazdı.Məktubda deyilirdi:

«Əziz Vladimir İliç!

Gəncə üsyanı zamanı köhnə Azərbaycan ordusunun bütün zabitləri həbs edilmişdir. Onların arsında tanınmış generallar Mehmandarov və Şıxlinski də vardır. Müfəssəl araşdırmadan sonra aydın olmuşdur ki, bu generalların günahı yoxdur. Lakin hər halda vəziyyətmiz möhkəmlənə qədər və bizim ümumi işimizə kömək göstərmək məqsədiylə qərara almışıq ki, onları qərargahda işləmək üçün Sizin sərəncamınıza göndərək. Çünki onlar hərbi mütəxəssis kimi əvəzolunmazdır. Onlardan biri -Şıxlinski Nikolay ordusunda artileriyanın allahı sayılırdı. Polşa cəbhəsinin sonuna kimi qoy onlar Moskvada işləsinlər, sonra isə xahiş edirəm onları bizə, qoşun hissələrimizin formalaşdırılmasına göndərəsiniz. Lazımdır ki, bu vaxt ərzində onlara qayğı göstərilsin. Onların siyasi əqidəsi-müsavatçılara nifrət edirlər və əmindirlər ki, Azərbaycan Sovet Rusiyasız mövcud ola bilməz. İngilislərin düşmənləridirlər, Rusiyanı sevirlər.

Kommunist salamı ilə N.Nərimanov».10 avqust 1920. (5, səh.362)

N.Nərimanovun məktubu ilə Moskvaya yollanan S.Mehmandarov və Ə.Şıxlinski Moskvaya çatan kimi yenidən həbs edildilər və Butır həbsxanasına atıldılar. «Azərbaycan ordusu» qəzetində Lətif Şükürovun yazdığına görə, onlar 1920-ci il avqust ayının 18-də həbs olunmuş və noyabr ayının əvvəlinə kimi həbsdə saxlanmışdılar. Onların azad edilməsində yenə də N.Nərmanov mühüm rol oynamış, o Ümumrusiya hakimiyyət orqanlarına müraciət etmiş və həbsdən azad olunmasına nail olumşdur.(6)



S.Mehmandarov və Ə.Şıxlinski ilə bağlı N.Nərimanovun V.İ.Leninə məktubunun surəti

Ə.Şıxlinskinin xatirələrində həbsxanada olmaları barədə məlumat yoxdur, ancaq Moskvaya göndərilmələrini, N.Nərimanovun məktub yazdığını və məktubun ona verildiyini təsdiq edir.



«N» hərbi hissəsinin qərargahı qarşısında S.Mehmandarovun xatirəsinə ucaldılmış abidə

1921-ci ilin yayında hər iki general yenidən Azərbaycana dəvət olunur. Səməd bəy Moskvadan qayıdan kimi Azərbaycanın Hərbiyyə və Bəhriyyə komissarının xüsusi tapşırıqlar üzrə köməkçisi təyin edilir. Ə.Şıxlinski xatirələrində yazır ki, bizim hər ikimiz Azərbaycan komanda məktəbində topçuluqdan, Mehmandarov rus, mən isə Azərbaycan dilindən dərs deməyə başladıq (8). 1922-ci ilin oktyabrın 18-də Azərbaycan XKS-nin iclasında hər iki generla maaşdan əlavə hər ay 50 qızıl manat verilməsi qərara alınır. Bu əlavə vəsait ömürlük kəsilirdi.

1924-cü ildən 1928-ci idə qədər S.Mehmandarov Azərbaycan Birləşmiş Komandirlər məktəbinin müəllimi oldu. 1928-ci il iyulun 1-də səhhəti ilə əlaqədar təqaüdə çıxdı və ona fəxri dövlət təqaüdü kəsilir. S.Mehmandarov və Ə.Şıxlinski ilə bağlı N.Nərimanovun V.İ.Leninə məktubunun surəti

Cümhuriyyət dövründə Gürcüstanda hərbi atteşeliyin zabiti olmuş Əsgər Əsgərov sonralar xatirələrində qeyd edirdi ki, Gəncə-Qarabağ antisovet üsyanlarından sonra milli zabitlər kütləvi şəkidə həbs edildilər və güllələndilər. Qısa müddətdə 266 zabit güllələndi. Onların arasında 12 general, 27 polkovnik və podpolkovnik vardı.

Səməd bəy Mehmandarov 1928-ci ildə səhhətinə görə istefaya çıxdı. Ona yüz manat pensiya kəsdilər. General 1931-ci il fevralın 12-də Bakıda vəfat etdi. Onu Çəmbərəkənd qəbiristanlığında dəfn etdilər. Həyat yoldaşı ərinin ölümündən sonra oğlunu da götürüb Sankt-Peterburqa köçdü. 1937-də onları Saratova, 1941- ci ildə isə Sibirə sürgün etdilər. Xanım faşistlərin partlatdığı qatarda həlak oldu.Oğlu isə sağ qaldı və sürgün həyatına davam etdi

S.M.Kirova heykəl qoyulanda Səməd bəyin uyuduğu qəbiristanlıq dağıdıldı. Yaxınları məlum səbəblərdən Bakıda deyildilər.Dövlətdən də heç kim qəbri köçürmək cəsarətində olmadı. Əvəzində, Sergey Mironoviçin heykəli uzun illər o qəbirlərin üstündən bütün bakılılara yol göstərdi.

Tarixdə qoçaq xalqlar çoxdur. Onlar düşmən qarşısında əyilməyi şərəfsizlik sanmış, qırx il qul kimi yaşamaqdansa, bir gün azad yaşamağı üstün tutmuşlar. Qoçaq bir sərkərdənin qələbə çalmasına, nailiyyətlər əldə etməsinə səbəb ancaq xalqların qoçaqlığı olmuşdur. Qoçaq xalqlar bəşəriyyətin dincliyini təmin etməli, demokratiyanın inkişafı və təkamülü uğrunda igidlik göstərməli və qorxmamalıdırlar. Azərbaycan xalqının azadlıq salnaməsində Babək, Koroğlu, Qaçaq Nəbi, Qaçaq Kərəm, Fərrux ağa Qayıbov, Səmədağa Mehmandarov, Əliağa Şıxlinski, Həzi Aslanov, İsrafil Məmmədov, Gəray Əsədov, Mehdi Hüseynzadə kimi qəhrəmanlar xüsusi yer tuturlar. Bu gün böyük sərkərdə, Vətənini canından əziz sevən, təhqirlərə və həbslərə sinə gərərək Azərbaycan ordusunun yaranması və hərbi sirlərə yiyələnməsində xüsusi rolu olan Səməd bəy Mehmandarov anarkən qəhrəmanlarımızın mərdliyi, cəsarətliliyi və igidliyindən qürur hissi keçiririksə, torpaqlarımızın işğalı qəlbimizi sızıldadır. Təxminən 100 il bundan əvvəl Azərbaycanın ərazi bütövlüyü uğrunda çətinliklərə sinə gərən Səməd bəyin ruhu narahatdır. O ruh ki, daim Azərbaycanı bütöv, müstəqil, qüdrətli görmək istəyirdi. Amma nə fayda, əsrin əvvəllərində olduğu kimi, əsrin sonlarında da məkrli qonşularımız imperiya qüvvələrinin köməyi ilə torpaqlarımızın 20 faizdən çoxunu işğal etdilər. Azərbaycan xalqı müstəqillik uğrunda yüzlərlə igidini itirdi. Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsində 20 mindən artıq soydaşımız şəhid, 100 mindən artıq Azərbaycan vətəndaşı şikəst oldu. Hesab edirəm ki, bu işğala da son qoyulacaq, bizdən sonrakı nəsil Azərbaycan tarixini yazarkən S.Mehmandarovların varislərini fəxrlə yad edəcəklər.

**Ədəbiyyat**

*1.Azərbaycan Respublkası Mərkəzi Dövlət Arxivi (AR MDA) f.2894, siy.1, iş 32*

*2.Elşad Qocayev, «Cəllad etirafı», Bakı, 1999*

*3.M.İ.Əmrahov, Ə.Çingizoğlu, H.İ.Həsənov. «Qarabağ xalığı». Dərs vəsaiti. Bakı, «Mütərcim», 2008, 220 s.*

*4.Dr.Mustafa Görüryılmaz.Türk Qafqaz İslam Ordusu və ermənilər (1918). Bakı, «Qismət», 2009, 408s.*

*5.Süleymanov M. Mehmandarov (həyatı, xidmət yolu və silahdaşları). Bakı, «Hərbi nəşriyyat», 2000, 376 s.*

*6. Lətif Şükürov. «Azərbaycanın tam artilleriya generalı», «Azərbaycan ordusu» qəzeti, 6 iyun 2000*

*7.Nəzirli Ş.Ə. «Azərbaycan generalları». Bakı, «Gənclik»,1991, 208 s.*

*8. Şıxlinski Ə. Xatirələrim. Bakı, «Azərnəşr», 1943*

**Mais Əmrahov,**
**Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru**



## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İngilis dili kafedrasının baş müəllimi

**Şəfiqə Nağıyevanın**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi coğrafiya kafedrasının müəllimi İlhamə Qəribovaya atası

**Əhmədin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 689
Sayı: 1500
Çapa imzalanıb: 29.02.2016-cı il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.